# İMAM HƏSƏN MÜCTƏBA ƏLEYHİSSƏLAMIN HƏYATI

2



MEHDİ PİŞVAYİ

# HƏSƏN MÜCTƏBA ƏLEYHİSSƏLAMIN HƏYATI

:Müəllif

Mehdi Pişvayi

:Çap nəşriyyat

Test

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

# HƏSƏN MÜCTƏBA ƏLEYHİSSƏLAMIN HƏYATI

## Kitab haqqında

Kitabın adı:İmam Həsən Müctəba əleyhissəlamın həyatı

Müəllif:Mehdi Pişvayi

Naşir:Test

:Çap tarixi

Səhifələrin sayı:٢٥

Çap növbəsi:Birinci

Tirajı:٣٠٠٠

səh:١

## İşarə



## İmam Həsən əleyhissəlamın həyatı barədə qısa mə’lumat

Əli əleyhissəlamın Peyğəmbərin (səlləllahu əleyhi və alih) əziz qızı xanım Zəhra (səlamullahi əleyha) ilə evlənməsinin ilk meyvəsi, şiələrin ikinci İmamı Həzrət Həsən

Müctəba (əleyhissəlam) hicrətin üçüncü ili ramazan ayının on beşində Mədinə şəhərində dünyaya gəlmişdir.(1)

---

1- Mənaqibi-Ali-Əbutalib (İbn Şəhr Aşub) c.4, səh.28; İrşadi-Şeyx Müfid, səh.187.

İmam Həsən (əleyhissəlam) öz cəddinin dövrünü çox görməmişdi. Çünki İmam Həsən (əleyhissəlam) təxminən yeddi yaşında olarkən Peyğəmbər (səlləllahu əleyhi və alih) dünyadan köçmüşdü. Peyğəmbərdən (səlləllahu əleyhi və alih) sonra təxminən otuz il atası Əli əleyhissəlamla birgə olmuşdur. Atasının şəhadətindən sonra (hicrətin qırxıncı ilindən) on il müddətinə qədər müsəlmanlara İmamlıq (başçılıq) etmiş və nəhayət hicrətin əllinci ilində Müaviyənin hiyləsi ilə qırx səkkiz yaşında zəhərlənmiş və şəhadətə .qovuşmuşdur. Müqəddəs məzarı Mədinə şəhərindəki Bəqi qəbiristanlığındadır

## Məzlumlarınköməkçisi

İslam dinində (İslam nöqteyi-nəzərindən) varlı və imkanlı şəxslər kasıb və imkansız şəxslərə qarşı böyük məs’uliyyət daşıyırlar. Dərin mə’nəvi əhdlər və müsəlmanlar arasında bərqərar olmuş dini qardaşlıqlara əsasən, varlılar kasıbların ehtiyaclarını mümkün qədər tə’min etməyə çalışmalıdırlar. İslam peyğəmbəri və dini rəhbərlər (İmamlar) bu barədə nə təkcə sifarişlər etmiş, hətta hərə öz zamanında .insansevərliyin və zəifpərvərliyin bir nümunəsi olmuşlar

İkinci İmam elm, təqva, zahidlik və ibadətlə yanaşı eyni zamanda öz dövrünün səxavətli şəxsi, məzlumların köməkçisi miskinlərə kömək edən bir şəxs kimi də tanınmışdır. O Həzrətin vücudu dərdli ürəklərin, fağır və imkansızların pənahı, ehtiyacı olanların ümid yeri idi. Belə ki, bir kasıb belə onun evindən əliboş geri qayıtmamışdır. Qəlbi sınmış hər hansı bir şəxs dərdini ona açıb söyləsəydi, İmam (əleyhissəlam) onun dərdinə mütləq bir məlhəm qoyardı. Hətta bə’zi vaxtlar imkansız şəxs özü ehtiyacını deməzdən və xəcalət təri tökməzdən qabaq İmam (əleyhissəlam) onun ehtiyacını .ödəyər və ona xəcalət təri tökməyə, utanmağa icazə verməzdi

Süyuti öz kitabında yazır:«Həsən ibn Əli (əleyhissəlam) bir çox əxlaqi dəyərlər və insani fəzilətlərə malik idi. O, alicənab, səbirli, vüqarlı, mətin, səxavətli və camaatın hörmət (bəslədiyi (rəğbətini qazanmış) bir şəxsiyyət idi.»(١

## İbrətamiz incəlik

İmam Həsən (əleyhissəlam) bə’zi vaxtlar ehtiyacı olan şəxslərə külli miqdarda pul bağışlayardı. Belə ki, bu miqdar pulu bir yerdə bağışlamaq camaatı heyran qoyardı.

İmam əleyhissəlamın bu cür külli miqdarda pulu bir dəfəyə bağışlamasının bir incəliyi o idi ki, İmam (əleyhissəlam) ehtiyacı olan şəxsi bir dəfəlik ehtiyacsız edərdi. İmkansız şəxs bu pulla bütün ehtiyaclarını ödəyər və bundan sonra da ehtiyacsız yaşaya bilərdi. Həmçinin, bu pulla əlinə sərmayə də gətirə bilərdi. İmam Həsən (əleyhissəlam) kasıba onun bir günlük ehtiyaclarını ödəyən miqdarda pul verməyi rəva görmürdü. Belə olan halda, həmin şəxs məcbur olub gündəlik yeməyi üçün ona-buna əl uzatmalı idi. Bu .səbəbə görə də Həzrət Həsən (əleyhissəlam) kasıba çoxlu pul verərdi

### Elm və fəzilət ailəsi

Bir gün Osman məscidin kənarında oturmuşdu. Kasıb bir kişi ondan kömək istədi. Osman çıxarıb ona bir dirhəm pul verdi. Kişi Osmana dedi: "Məni elə bir adamın yanına göndər ki, mənə bir az çox kömək etsin." Osman məscidin bir küncündə əyləşmiş İmam Həsən (əleyhissəlam) və Abdullah ibn Cə'fərə tərəf işarə edib kişiyə dedi ki, orada oturmuş cavanların yanına get və onlardan kömək istə. Kişi onların yanına gəlib kömək istədi. İmam



---

.Tarixül-xüləfa (Süyuti), səh.۱۸۹ ۱ -۱

Həsən (əleyhissəlam) buyurdu: “Ancaq üç halda başqalarından maddi kömək istəmək olar: Boynunda diyə (qan bahası) olub onu ödəyə bilmədikdə; külli miqdarda borclu olub qaytarmaq iqtidarında olmadıqda və ehtiyac içində olub əli heç bir yerə çatmadıqda. İndi bu üç şeyin hansı biri sənə üz vermişdir?” Kişi cavab verdi ki, mənə də məhz bu üç şeydən biri üz verib. İmam Həsən (əleyhissəlam) çıxarıb əlli dinar (bir dinar on dirhəmə bərabərdir) pul kişiyə verdi. Bunu görən İmam Hüseyn (əleyhissəlam) da .qırx doqquz dinar, daha sonra Abdullah ibn Cə’fər qırx səkkiz dinar kişiyə verdilər

Kasıb kişi qayıdarkən Osmanın yanından keçirdi. Osman kişiyə dedi: “Nə oldu?” Kişi cavab verdi ki, səndən pul istədim verdin, ancaq heç soruşmadın pulu nəyə görə istəyirəm. Ancaq o üç nəfərin yanına gedəndə, onlardan biri (İmam Həsən (əleyhissəlam)) istəyimin səbəbini soruşdu. Mən də cavab verdim. Sonra onların hərəsi mənə bu qədər pul verdi. Osman dedi: “Bu ailə elm, hikmət çeşməsi, fəzilət və yaxşılıq ” (mənbəyidir. Onlar kimisini nə vaxt tapa bilərsən?(١)

### Misilsiz bəxşiş

İmam Həsən (əleyhissəlam) bütün qüdrətini yaxşı və Allah bəyənən yollarda sərf edər, Allah yolunda çoxlu miqdarda pul bəxşiş edərdi. Tarixçilər və alimlər o Həzrətin şərəfli həyatı haqqında misilsiz bir bəxşiş qeyd etmişlər ki, bu da heç bir rəhbərin həyatında gözə dəymir. İmamın bu hərəkəti o Həzrətin əliaçıqlığından əlavə onun dünyanın aldadıcı naz-ne’mətinə olan e’tinasızlığını da göstərir. Tarixçilər yazırlar: «İmam Həsən Müctəba (əleyhissəlam) ömründə iki dəfə bütün mal-dövlətini, üç dəfə isə mal-(dövlətinin tən yarısını Allah yolunda xərcləmişdir.»(٢)

### Vasitəli köməklik

İmam Həsən əleyhissəlamın şəxsiyyətinin böyük və ali olması bir nəfər imkansız şəxsin onun evindən əliboş geri qayıtmasına icazə vermirdi. İmamın birbaşa və bilavasitə kömək etməyə imkanı olmadıqda, vasitəli şəkildə imkansızların ehtiyacını ödəməyə çalışardı. O, müxtəlif yollarla tədbir görüb ehtiyacları ödəyər və müşkülatı .həll edərdi

Belə rəvayət olunur ki, bir gün Həzrətin cavanlıq dövrlərində ikinci xəlifənin zamanında

kasıb bir kişi onun (ə) yanına gəlib kömək istədi. İş elə gətirmişdi ki, həmin vaxt İmamın pulu yox idi. Digər tərəfdən də kasıb kişinin onun evindən əliboş geri qayıtması İmam əleyhissəlamı utandırırdı. Buna görə İmam Həsən (əleyhissəlam) kişiyə :buyurdu

?Səni məqsədinə çatmaq üçün bir yerə göndərsəm razı olarsan

?Hara

Bu gün xəlifənin qızı rəhmətə getmişdir, xəlifə qızına əza saxlayır, hələ heç kəs ona gəlib başsağlığı verməmişdir. Xəlifənin yanına get və sənə öyrədəcəyim ifadə ilə ona .başsağlığı ver. Sən bu yolla öz məqsədinə nail olarsan

?Xəlifəyə necə başsağlığı verim



---

.Biharül-ənvar, c.۴۳, səh.۳۳۳ [۱]-۱
.Tarixül xüləfa. səh.۱۹۰; Tarixi-Yə’qubi, c.۲, səh.۲۱۵; Təzkirətül-xəvas səh.۱۹۶ [۲]-۲

Xəlifənin yanına gedib belə de: “Əlhəmdu lillahilləzi sətərəha biculusikə əla qəbriha və la hətəkəha biculusiha əla qəbrik.» İfadənin mə’nası belədir: “Həmd olsun Allaha ki, səni qızının qəbri üstündə oturmaqla onun həyasını saxladı və onu sənin qəbrin üstündə oturmaqla həyasını aparmadı.» Yə’ni qızın səndən qabaq dünyasını dəyişib torpaq altında yatmışdırsa, bu, atasının sayəsindədir. Yox əgər sən ondan tez .ölsəydin, ola bilərdi ki, onun həyası getsin

.Kasıb kişi İmam əleyhissəlamın dediyi kimi də etdi

Məhəbbətlə dolu olan xəlifənin qəlbində böyük tə’sir göstərdi və onun kədərini, qəm-qüssəsini azaltdı. Xəlifə əmr etdi ki, kişiyə bəxşiş versinlər. Sonra xəlifə kişidən soruşdu: “Bu sözləri sən özündən dedin, yoxsa səni bir öyrədən var?” Kişi cavab verdi ki, xeyr, bunları mənə Həsən ibn Əli (əleyhissəlam) öyrətmişdir. Xəlifə dedi: “Doğru (deyirsən, o, fəsahətli və şirin sözlər mənbəyidir.”(١

## İmam Həsən əleyhissəlamın Müaviyə ilə bağladığı sülhün səbəbləri haqqında araşdırmalar

### İşarə

İmam Həsən əleyhissəlamın həyatının ən əsas və ən mühüm hissəsi onun Müaviyə ilə sülh bağlaması və İmamın məcburi şəkildə xilafətdən, eləcə də İslam hökumətindən kənarlaşdırılmasıdır. İmam əleyhissəlamın həyatının bu hissəsi barədə çoxlu söhbətlər olmuş və hətta bu hissə diqqətsiz dostların və qərəzçi düşmənlərin səhvə yol .verməsinə səbəb olmuşdur

Bə’ziləri İmam Həsən əleyhissəlamın həyatını və o günkü dövrün hadisələrini mütaliə edərək belə suallar irəli sürürlər ki, nəyə görə İmam Həsən (əleyhissəlam) Müaviyə ilə sülh etmişdir? Məgər Əli əleyhissəlamın şəhadətindən sonra o Həzrətin şiələri və ardıcılları onun oğlu İmam Həsən əleyhissəlama bey’ət etməmişdilər? Yaxşı olmazdımı ki, İmam Hüseyn (əleyhissəlam) qaldıran qiyamı, İmam Həsən (əleyhissəlam) elə əvvəlcədən qaldıraydı? Belə olduqda ya qalib gələrdi, ya da şəhadəti ilə Müaviyənin .hökumətini laxladardı

:Bu suallara cavab verməzdən qabaq üç məsələyə diqqət yetirmək lazımdır

## İmam Həsən əleyhissəlamın imamətindən qabaqkı mübarizələri .١

### İşarə

Tarix şahiddir ki, İmam Həsən (əleyhissəlam) çox şücaətli və dözümlü bir insan olmuşdur. Qorxu heç vaxt ona yol tapa bilməmişdir. O, İslamın inkişafı yolunda əlindən .gələni əsirgəmirdi və daima Allah yolunda cihad etməyə hazır idi

### İmam Həsən (əleyhissəlam) Cəməl döyüşündə

İmam Həsən (əleyhissəlam) Cəməl döyüşündə atası ilə bərabər cəbhənin ön xəttində vuruşur və Əli əleyhissəlamın şücaətli və dilavər dostlarını ötərək düşmən ordusuna güclü hücumlar edirdi.(٢) Döyüş başlamazdan qabaq isə atasının əmri ilə Əmmar Yasir və Əli əleyhissəlamın bir neçə digər dostları ilə birgə Kufə şəhərinə gəlib əhalini bu (döyüşdə iştirak etməyə çağırmışdı.(٣



---

.Həyatul-imamil-Həsən (əleyhissəlam), c.١, səh.٣٠٢ ١ -١

.Mənaqibi-Ali-Əbutalib, c.۴, səh.٢١ [٣] -٢

.Tarixi-Yə’qubi, c.٢, səh.١٧٠; Əl-İmamətu vəs-siyasət, c.١, səh.۶٧ [۴] -٣

İmam Həsən (əleyhissəlam) Kufəyə gələndə, hələ Əbu Musa Əş’əri Kufənin Osman tərəfindən tə’yin edilmiş hökumət başçılarından biri kimi qalırdı. Əbu Musa Əş’əri bu vəzifəsindən istifadə edərək Əli əleyhissəlamın ədalət əsasında qurulmuş hökuməti ilə müxalifət edir və şəhər əhalisini Cəməl döyüşündə iştirak etməkdən və o Həzrətə arxa durmaqdan çəkindirirdi. Ancaq buna baxmayaraq İmam Həsən (əleyhissəlam) Kufədən doqquz min nəfərlik ordu yığıb Cəməl döyüşünə getmişdi.(١)

### İmam Həsən (əleyhissəlam) Siffeyn döyüşündə

İmam Həsən əleyhissəlamın Siffeyn döyüşündə də ordunu səfərbər edib Əli əleyhissəlamın başçılığı altına gətirməkdə böyük rolu olmuşdur. O Həzrət öz mətin və kəskin çıxışları ilə Kufə əhalisini Əli əleyhissəlamın ordusuna qoşularaq xainlər və İslam düşmənlərinə qarşı vuruşmağa də’vət edirdi.(٢)

İmam Həsən əleyhissəlamın haqq yolunda fədailiyi o dərəcədə idi ki, Əli (əleyhissəlam) Siffeyn döyüşündə öz səhabələrinə deyirdi ki, Həsən və qardaşı Hüseynin (əleyhimassəlam) mübarizə etməkdən qarşısını alın, məbada onların ölümü ilə Peyğəmbərin (səlləllahu əleyhi və alih) nəsli kəsilə.(٣)

### ٢. İmam Həsən əleyhissəlamın Bəni–Üməyyə ilə kəskin mübarizələri

İmam Həsən (əleyhissəlam) haqqı bəyan etməkdə və İslam əsaslarını qorumaqda əsla səhlənkarlıq etməzdi. O, Müaviyənin qeyri-İslami hərəkətlərini açıq-aşkar tənqid edir və Müaviyənin, ümumiyyətlə, bütün Bəni-Üməyyənin nankor və çirkin sabiqələrini qorxmadan açıb söyləyirdi.

İmam Həsən əleyhissəlamın Müaviyə və onun əlaltıları ilə, o cümlədən Əmr As, Ütbə ibn Süfyan, Vəlid ibn Ütbə, Müğeyrə ibn Şü’bə və Mərvan ibn Həkəm kimilərlə apardığı kəskin mübahisələri bu iddianın şahididir.(٤)

İmam Həsən (əleyhissəlam) hətta sülh bağladıqdan və Müaviyənin qüdrəti bir az artıb mövqeyi gücləndikdən sonra o, Kufəyə gələndən sonra İmam (əleyhissəlam) minbərə çıxıb sülh bağlamasının səbəblərini söyləyərək Əli əleyhissəlamın ailəsinin üstünlüklərini (fəzilətlərini) bəyan etdi və sonra hər iki dəstənin (həm öz dəstəsinin, həm də Müaviyənin dəstəsinin) qarşısında Müaviyənin zəif cəhətlərinə işarə edib onun

(idarə etdiyi hökuməti aşkar şəkildə tənqid etdi.(۵

Əli əleyhissəlamın şəhadətindən və İmam Həsən əleyhissəlamın Müaviyə ilə sülh bağlamasından sonra xəvaric (Əli əleyhissəlamın üstünə qiyam çəkib Nəhrəvan döyüşündə məğlub olanlar) bütün qüvvələrini Müaviyənin əleyhinə səfərbər etdilər. Kufədə Müaviyəyə xəbər çatdı ki, Hövsəreyi-Əsədi adlı xəvaric başçılarından biri onun əleyhinə qiyam qaldırıb öz ətrafına ordu toplamışdır. Müaviyə öz mövqeyini qoruyub saxlamaq və İmam Həsən əleyhissəlamın ona tabe olduğunu sübut etmək üçün Mədinəyə getməkdə olan İmam əleyhissəlama xəbər göndərdi ki, Hövsərənin qiyamını yatızdırıb sonra öz yoluna davam etsin. İmam Həsən (əleyhissəlam) ona cavab göndərdi ki, mən müsəlmanların qanının tökülməməsinə görə səndən əl çəkdim (səninlə sülh bağladım). Bu o demək deyil ki, mən sən deyənə qulaq asıb başqaları ilə vuruşam. Əgər vuruşmalı



---

.Əl-Əxbarut-təval, səh.۱۴۴-۱۴۵ [۵] -۱

.Vəq'ətu Siffeyn, səh.۱۱۳ [۶] -۲

.(Şərhi-Nəhcül-bəlağə (İbn Əbil Hədid), c.۱۱, səh.۲۵ (Xütbə ۲۰۰ [۷] -۳

.Ehticac, səh.۱۴۴-۱۵۰ [۸] -۴

.Ehticac, səh.۱۵۶ [۹] -۵

olsam, hamıdan qabaq birinci səninlə vuruşaram. Çünki, səninlə mübarizə etmək xəvariclə vuruşmaqdan daha vacibdir.(1)

İmam əleyhissəlamın bu cümlələrində mübarizə ruhu açıq-aşkar hiss olunur. Xüsusən İmamın əzəmətlə Müaviyəyə dediyi «səndən əl çəkdim» ifadəsi bu mə'nanı vurğulayır.

### 3. İslamda sülhün qaydası

Nəzərə almaq lazımdır ki, İslam dinində müharibə və cihad haqqında ümumi bir qanun yoxdur. İslam dini müəyyən şəraitdə müsəlmanlara kafirlərə qarşı vuruşmağı əmr etdiyi kimi bə'zi vaxtlarda da vuruşmağın bir nəticə verməyəcəyini görüb işi sülhlə həll etməyi əmr edir.

Biz İslam Peyğəmbərinin (səlləllahu əleyhi və alih) həyatında bu iki halın hər ikisini müşahidə edirik. İslam peyğəmbəri Bədr, Ühüd, Xəndək və Hüneyndə döyüşürdüsə, digər şəraitdə isə qələbəni qeyri-mümkün gördükdə, kafirlərlə sülh bağlayır və müvəqqəti olaraq döyüşdən əl çəkir və bu yolla İslamın inkişafına şərait yaradırdı.

Peyğəmbərin (səlləllahu əleyhi və alih) Bəni-Zəmrə və Bəni-Əşcə' eləcə də (Məkkə əhalisi ilə) Hüdeybiyyə sülhü bağlaması buna bir nümunədir.(2)

Buna əsasən, İslam Peyğəmbəri (səlləllahu əleyhi və alih) o günlər bə'ziləri üçün mə'lum olmayan ali məsləhətlərə görə düşmənlə müvəqqəti sülh bağladı, İmam Həsən (əleyhissəlam) da Allah tərəfindən dini rəhbər seçildiyi üçün hadisənin bütün cəhətlərindən başqalarından daha yaxşı xəbərdar idi. Buna görə də, özünəməxsus uzaqgörənliyi ilə İslam cəmiyyətinin xeyrini sülhdə görüb sülh bağlayır.

Bu mövzu (İmam Həsən əleyhissəlamın sülhü) pis mə'nada başa düşülməməlidir. Əksinə, o Həzrətin elədiyi hərəkət eynilə Peyğəmbərin (səlləllahu əleyhi və alih) (Hüdeybiyyə sülhündə) elədiyi hərəkət kimi nəzərə alınmalıdır.

İndi isə İmam Həsən əleyhissəlamın sülhünün səbəblərini və onun tarixi əhəmiyyətini yaxşı anlamaq üçün tarixi səhifələməli və bu məsələni əsas tarixi faktlara istinad edərək araşdırmalıyıq.

Qısa olaraq deməliyik ki, əslində İmam Həsən (əleyhissəlam) öz istəyi ilə sülh etmədi, əksinə, o sülh etməyə məcbur oldu. Yə’ni, vəziyyətin və şəraitin yaxşı olmaması və bir çox digər səbəblər üzündən elə bir vəziyyət yarandı ki, sülh etmək İmam Həsən (əleyhissəlam) üçün zəruri bir məsələyə çevrildi və o Həzrət sülh etməkdən savayı başqa bir çarə görmədi. Belə ki, kim o Həzrətin yerində olub həmin şəraitdə olsaydı, sülhdən başqa çarəsi olmazdı. Çünki İslam hökumətinin həm xarici şəraiti, həm də İraqın daxili vəziyyəti və habelə, İmamın ordusu döyüşə hazır deyildi. İndi isə bu .məsələləri ayrı-ayrılıqda araşdıraq

### Xarici siyasət nöqteyi–nəzərindən

O vaxtkı xarici siyasət nöqteyi-nəzərindən müsəlmanların bir-biri ilə vuruşması İslam aləminə heç bir fayda verməyəcəkdi. Çünki İslamdan güclü zərbələr alan Şərqi Roma imperiyası bu məğlubiyyətlərin əvəzini çıxmaq və özünü İslam nüfuzundan azad etmək üçün münasib bir fürsət axtarırdı. İmam Həsən əleyhissəlamın



---

.Şərhi-Nəhcül-bəlağə (İbn Əbil-Hədid) c.۵, səh.۹۸; Əl Kamilu fit-tarix. c.۳, səh.۴۰۹ [۱۰] -۱

İmam Həsən (əleyhissəla) ona Müaviyə ilə sülh bağlamasına irad tutan bir kişiyə [۱۱] -۲ belə cavab verir: Mən Peyğəmbərin (səlləllahu əleyhi və alih) sülh bağladığı səbəblərə əsasən sülh bağladım. Biharül-ənvar, c.۱۴۴, səh.۲

Müaviyə ilə vuruşmaq istədiyini eşidən Roma imperiyasının başçıları belə fikirləşdilər ki, öz məqsədlərini həyata keçirmək üçün ən yaxşı fürsətdir. Buna görə də, müsəlmanlardan əvəz çıxmaq, böyük bir ordu ilə İslam ölkəsinə hücum etmək qərarına gəldilər. Belə bir vaxtda vəzifəsi İslamın əsasını qorumaq olan İmam Həsən (əleyhissəlam) kimi bir şəxsiyyət bu təhlükəni İslam ölkəsindən dəf etmək üçün ruhu sıxıntılı və düşüncəsiz insanların tə'nələri ilə nəticələnməsinə baxmayaraq sülhü qəbul ?etməkdən başqa bir yol seçə bilərdimi

Görkəmli tarixçi Yə'qubi yazır: «Müaviyə (İmam Həsən əleyhissəlamla sülh bağlayıb) Şama qayıdandan sonra ona xəbər çatdı ki, Roma imperatoru İslam ölkəsinə hücum etmək məqsədilə böyük və nizamlı bir ordu ilə Romadan çıxmışdır. Müaviyənin belə böyük bir ordu ilə üzləşməyə imkanı olmadığından onlarla sülh bağlayıb yüz min dinar Şərqi Roma imperatoruna verməli oldu.»(١) Bu tarixi sənəd göstərir ki, iki müsəlman dəstənin bir-biri ilə döyüşmək istədiyi bir vaxtda onların müştərək düşməni - Roma imperiyası bu fürsətdən istifadə edib onlara hücum etməyə hazırlaşmışdı. Təbii ki, belə bir vəziyyət də İslam ölkəsini çox ciddi bir təhlükə ilə üzləşdirirdi. Əgər belə bir vaxtda İmam Həsən (əleyhissəlam) qoşun çəkib Müaviyə ilə vuruşsaydı, bu döyüşdə nə İmam Həsən (əleyhissəlam) qalib gələcəkdi, nə də Müaviyə. Əksinə, bu döyüşdə qalib gələn tərəf Şərqi Roma imperiyası olacaqdı. Ancaq bu təhlükə İmamın uzaqgörənliyi, tədbir və güzəştə getməsi nəticəsində dəf oldu. İmam Baqir (əleyhissəlam) İmam Həsən (əleyhissəlam)ın sülhünə irad tutan bir nəfərə buyurdu ki, əgər İmam Həsən ((əleyhissəlam) sülh etməsəydi, İslamı böyük təhlükə gözləyirdi.(٢

#### Daxili siyasət nöqteyi-nəzərindən

Hamıya mə'lumdur ki, hər hansı bir rəhbər və ya başçı döyüş meydanında düşmənə qalib gəlmək istəyirsə, gərək güclü və hazırlıqlı orduya malik olsun. Lakin belə bir orduya malik olmadan döyüşə girmək biabırçı məğlubiyyətdən başqa heç bir nəticə verməyəcək. İmam Həsən əleyhissəlamın sülhünün səbəblərini daxili siyasət nöqteyi-nəzərindən araşdırdıqda, gözə çarpan əsas səbəb məhz belə bir ordunun olmamasıdır. Çünki İraq camaatının, xüsusilə də Kufə əhalisinin İmam Həsən əleyhissəlamın dövründə nə ruhən döyüşə hazırlığı var idi, nə də ordu təşəkkül tapa .bilmişdi

## Döyüş yorğunluğu

Cəməl, Siffeyn və Nəhrəvan döyüşləri, həmçinin Əbu Musa Əş’əri ilə Əmr As arasındakı danışıqlardan sonra İraq, Hicaz və Yəməndə baş verən və bir çox tələfatlarla nəticələnən Əli əleyhissəlamın və Müaviyənin qoşunları arasındakı qırğınlar Əli əleyhissəlamın dostlarının əksəriyyətində yorğunluq əmələ gətirmiş, onlar daha döyüşməmək və sülh etmək fikrinə düşmüşdülər. Çünki onlar Əli əleyhissəlamın beş illik hakimiyyəti dövründə başdan-başa müharibələrdə olmuşdular. Digər tərəfdən də onların döyüşü heç də yadelli işğalçılara qarşı deyil, əksinə, dünən onlarla qardaş olub bu gün Müaviyənin ordusuna qatılmış adamlarla olmuşdu.(۳)



---

۱- [۱۲] Tarixi-Yə’qubi, c.۲, səh.۲۰۶

۲- [۱۳] Biharül-ənvar, c. ۴۴, səh.۱.

۳- ۱ Cəməl döyüşündə otuz mindən çox, Nəhrəvan döyüşündə xəvaricdən dörd min, Siffeyn döyüşündə isə iki tərəfdən yüz on mindən çox itki olmuşdur. (Tarixi-Yə’qubi, c.۲, səh.۱۷۲-۱۸۲; Mürucuz-zəhəb, c.۲,səh.۳۹۳).

İraq camaatı bəhanələr gətirməklə Şam ordusunun Hicaz, Yəmən və İraqda törətdikləri vəhşiliklərinə qarşı vuruşmaq üçün ordunu göndərməkdə tənbəllik edib, başlarının dinc olması ilə əslində döyüşdən yorulduqlarını bildirirdi. İraq camaatının Əli əleyhissəlamın yenidən qüvvə toplayıb Siffeyn döyüşünə də’vətini gec qəbul etməsi bu (yorğunluğa açıq-aşkar bir nümunədir.(١

Doktor Taha Hüseyn Əbu Musa Əş’əri ilə Əmr As arasındakı danışıqlardan və Siffeyn döyüşünün sonundakı vəziyyətin gərginləşməsini qeyd etdikdən sonra yazır: «Sonra Əli (əleyhissəlam) Şama hücum etmək qərarına gəldi. Lakin ordusundakı münafiqlər – “Kufəyə qayıdıb işlərimizi səliqə-sahmana salaq, ondan sonra bir az da çox qoşunla düşmənin üstünə hücum edərik” – dedilər. Əli (əleyhissəlam) onlarla birgə Kufəyə gəldi və bir daha döyüşə getmədi. Çünki ordusunda olanların hər biri öz evinə dağılışıb şəxsi işlərilə məşğul olmağa başladılar. Döyüşmək üçün o qədər səhlənkarlıq edib süstləşdilər ki, Əli (əleyhissəlam) artıq onlara qarşı naümid oldu. Əli (əleyhissəlam) daima onları cihada də’vət edir və bunu dəfələrlə təkrar edirdi, ancaq onlar İmamın də’vətini nə eşidir, nə də qəbul edirdilər. Hətta iş o yerə çatmışdı ki, Əli (əleyhissəlam) bir gün xütbələrinin birində buyurdu: «Öz asiliyinizlə mənim əmrimdən çıxdınız. Hətta iş o yerə çatdı ki, Qüreyş dedi: Əbutalibin oğlu şücaətli kişidir, ancaq döyüşməkdən «?xəbəri yoxdur. Allah babalarına rəhmət eləsin, kim döyüşməyi məndən yaxşı bilir

Əli (əleyhissəlam) şəhadətə yetişdikdən sonra onun yerinə İmam Həsən (əleyhissəlam) hakimiyyətə gəldikdə, bu məsələ daha da qabarıq surətdə aşkar oldu. Xüsusilə İmam (əleyhissəlam) Kufə camaatını Şam ordusuna qarşı vuruşmağa də’vət .edəndə onlar İmam əleyhissəlamın də’vətini çox gec qəbul etdilər

Müaviyə nin ordusunun Kufə yə tə rə f hə rə kə t etmə si xə bə ri İ mam Həsən əleyhissəlama yetişdikdə ,İmam camaatı məscidə yığdı. Xütbəyə başlayıb Müaviyənin ordusunun səfərbər olmasını camaata çatdırdıqdan sonra camaatı Allah yolunda (cihada və batilin tərəfdarlarına qarşı vuruşmağa də ’vət etdi. İmam (əleyhissəlam

bildirdi ki səbirli olmaq fədakarlıq etmək və çətinliklərə dözmək lazımdır. İmam Həsən ((əleyhissə lam

camaatın ruhiyyə sində n xə bə rdar olduğ undan onların bu də ’və tə qarş ı müsbə t

.cavab verməməsindən nigaran idi

Elə belə də oldu. İmam (əleyhissəlam) camaatı döyüşə də'vət etdiyi xütbəni qurtardıqdan sonra hamı sükut etdi,

İmamın sözlərini təsdiq edən bir nəfər də tapılmadı. Bu hadisə o qədər təəssüflə ndirici və acınacaqlı idi ki,

məclisdə hazır olan Əli əleyhissəlamın şücaətli səhabələrindən biri camaatı bu səhlənkarlıqlarına görə

möhkəm danladı və onları yalançı qəhrəmanlar, qorxaq və şücaətsiz insanlar kimi qələmə verərək onları İmamla

(birgə Şam ordusuna qarşı vuruşa çağırdı.(٢

Bu tarixi sənəd İraq camaatının döyüşdən nə qədər yorulduqlarını

onlardakı mübarizə və döyüş ruhiyyəsinin ölməsini çox yaxşı bəyan edir. Onlar döyüşməyə hazır deyildilər.

Nəhayət İmam Həsən əleyhissəlamın yaxın səhabələrindən bir neçəsi camaatı səfərbər etmək

məqsədilə çıxışlar etdi. Bundan sonra İmam Həsən (əleyhissəlam) kiçik bir ordu ilə Kufədən çıxaraq şəhərin

yaxınlığında Nüxeylə adlı bir yerdə düşərgə saldı. İmam əleyhissəlamın ordusu təzə qüvvələrin gəlib onlara

birləşməsi məqsədilə on gün Nüxeylədə qaldı. Nəhayət, dörd min nəfər İmamın başına toplaşdı. Buna görə

də, İmam (əleyhissəlam) məcbur olub güclü ordu toplamaq məqsədilə Kufəyə (qayıtdı.(٣

.Səvrətül Hüseyn (əleyhissəlam), səh.۱۹۷-۲۰۰. Hüseyn (əleyhis səlam), səh.۱۹۷-۲۰۰ -۱

İslam aynası səh.۲۵۰۱ İslam aynası səh.۲۵۰-۲۵۱ Nəhcül-bəlağə (İbn Əbil Hədid -۲ c.۱۶؛ səh.۳۸) Ənsabul-Əşraf səh.۶۰

.İmam Həsən əleyhissəlamın sülhü (Şeyx Razi), səh.۱۰۲ -۳

## Müxtəlif ünsürlü cəmiyyət

Yuxarıda deyilənlərdən əlavə, o dövrün İraq camaatı mütəşəkkil və vahid deyildi. Əksinə, cəmiyyət müxtəlif ünsürlü və bir-biri ilə zidd olan dəstələrdən təşkil olunmuşdu. Belə ki, bə'zi vaxtlar bu dəstələr bir-biri ilə heç cür yola gedə bilmirdilər. Bir dəstə çox təhlükəli olan Əməvilər sülaləsinin tərəfdarı, digər bir dəstə həm Əməvilərlə, həm də İmam Həsən əleyhissəlamla vuruşmağı özlərinə vacib bilən xəvaric dəstəsi, başqa bir dəstə müxtəlif yerlərdən gəlib İraqda məskunlaşmış və sayı iyirmi min nəfərə çatan qeyri-ərəb müsəlmanlar, başqa bir dəstə də əqidəsi sabit olmayan, İmam Həsən əleyhissəlamla Müaviyə arasında hansı birinin üstün olmasında şəkk edən insanlardan ibarət idi. O dövrün İraq və Kufə əhalisi bu dəstələrdən təşkil olunmuşdu. Bunlardan fərqli olaraq digər bir dəstə də Əli əleyhissəlamın həqiqi dostları idi.(١)

## Pərakəndə ordu

Əhali arasındakı bu dəstələr təbii ki, İmam Həsən əleyhissəlamın ordusunda da yayılmış, ordunu pərakəndə hala gətirib çıxarmışdı. Buna görə də, xarici düşmənlərə qarşı mübarizədə belə bir orduya arxalanmaq heç cür mümkün deyildi.

Şiə məzhəbinin böyük ustadı mərhum Şeyx Müfid və başqa tarixçilər İmam Həsən əleyhissəlamın ordusundakı bu təhlükə barədə belə yazırlar: «İraq əhalisi çox gec və süstlüklə İmam Həsən əleyhissəlamın ordusuna qoşuldu. İmam Həsən əleyhissəlamın təşkil etdiyi qoşun aşağıdakı dəstələrdən ibarət idi:

١) Əli əleyhissəlamın şiələrindən ibarət tərəfdarları;

٢) Xəvaric; (Onlar Müaviyə ilə döyüşmək üçün bütün yollara əl atmışdılar. Onların İmam Həsən əleyhissəlamın dəstəsinə qoşulması Müaviyə ilə düşmənçiliklərinə görə idi.)

٣) Dünyapərəst və mənfəətpərəst şəxslər; Bunlar da özlərinə maddi mənfəət əldə etmək üçün İmam Həsən əleyhissəlamın ordusuna qoşulmuşdular.

٤) İkiürəkli və şəkk edən insanlar; Onların nəzərincə İmam Həsən (əleyhissəlam) kimi

.böyük bir şəxsiyyətin Müaviyədən elə bir üstünlüyü yox idi

Nəhayət, din xatirinə yox, əksinə, qəbilə düşmənçiliyinə görə və sadəcə olaraq öz (۵ (qəbilə başçılarından itaət edib mübarizəyə qoşulanlar.(۲

Beləliklə də, İmam Həsən əleyhissəlamın ordusu Müaviyə kimi bir düşmənə qarşı .mübarizədə lazımi təşəkkülü tapmamış və pərakəndə şəkildə olmuşdu

## Canlı sənəd

O dövrün İraq əhalisinin pərakəndəliyini və camaatın döyüşə qarşı süstlüyünü, əslində heç kim İmam Həsən əleyhissəlamın özündən yaxşı bəyan edə bilməz. İmam Həsən (əleyhissəlam) ordusunun irəlilədiyi son məntəqə olan Mədaində çox geniş və ruhlandırıcı bir çıxış etdi. O, sözlərinin əsnasında buyurdu: «Bizi Şam əhlinə qarşı (Müaviyənin ordusuna qarşı) mübarizədən heç bir şəkk-şübhə saxlaya bilməz. Biz bundan qabaq da sizin dözümünüz və daxili anlayışınızla Şam əhlinə qarşı mübarizə etmişik. Ancaq bu gün kin-küdurət nəticəsində vəhdət və



---

.İmam Həsən əleyhissəlamın sülhü, səh.۶۸-۷۴ [۱۵] -۱

.Əl-İrşad, səh.۱۸۹ [۱۶] -۲

qarşılıqlı anlaşma sizdən uzaqlaşmış, öz müqavimətinizi itirmiş və indi də giley-güzar edirsiniz. Siffeyn döyüşünə gedəndə dininizin mənfəətini dünya mənfəətinizə üstün tutdunuz, lakin indi isə dünyanızı dininizdən üstün tutursunuz. Biz indi də keçmişdə olduğumuz kimiyik, ancaq siz bizə qarşı keçmişdə olduğunuz kimi vəfadar deyilsiniz. Sizlərdən bə’ziləri Siffeyn döyüşündə, bə’ziləri də Nəhrəvan döyüşündə öz qohum-əqrəbasını, yaxınlarını itirmişdir. Birinci dəstə öz ölülərinə ağlayır, ikinci dəstə isə ölülərinin qan bahasını istəyir. Qalanları da bizim əmrlərimizdən boyun qaçırırlar. Müaviyə bizə insafdan uzaq, bizim izzət və böyük məqsədimizin əksinə olan bir təklif etmişdir. İndi əgər Allah yolunda ölməyə hazırsınızsa, deyin, onda mübarizəyə qalxaq və onun bu təklifinə qılıncla cavab verək. Yox, əgər sağ qalmaq istəyirsinizsə, deyin, onda bu təklifi qəbul edib sizin razılığınızı tə’min edək.»

İmam əleyhissəlamın sözləri bu yerə çatanda hamı bir ağızdan biz yaşamaq istəyirik, biz sağ qalmaq istəyirik(١) – deyə qışqırdı.

Döyüş ruhiyyəsindən məhrum olmuş belə bir ordu ilə İmam Həsən (əleyhissəlam) Müaviyəyə qarşı necə mübarizəyə girişə bilərdi? Müxtəlif ünsürlü dəstələrdən təşkil olunmuş və kiçik bir qəflət nəticəsində özləri xətər törədə bilən bir ordu ilə qələbəmi əldə etmək olar? Fərz edək ki, İmam Həsən (əleyhissəlam) deyil, Müaviyə belə bir qoşuna başçılıq edir, o İmam əleyhissəlamın gördüyü bu, işdən (sülhdən) başqa bir iş görə bilərdimi?

Bəli, bu səbəblər yığışıb İslam cəmiyyətini qəti təhlükənin iki addımlığına çatdırdı və çox acınacaqlı hadisələr əmələ gətirdi. İndi bunun şərhini sizin nəzərinizə çatdırırıq.

### İmam Həsən əleyhissəlamın ordunu səfərbər etməsi

Keçmiş və müasir tarixçilər bə’zi tarixi hadisələri dəyişdirib onun əksini yazırlar. Onlardan bə’ziləri belə iddia edirlər ki, güya İmam Həsən əleyhissəlamın Müaviyə ilə vuruşmaq məqsədi yox idi. Elə xilafətin ilk günlərindən bu fikirdə idi ki, Müaviyədən maddi imkanlar alıb rahat yaşasın. Müaviyə ilə müxalifət edirdisə də, bu imkanları tə’min etmək üçün edirdi.

Əldə olan tarixi sənədlər göstərir ki, bu töhmətlər tamamilə yalandır və tarixi

həqiqətlərlə heç cür uyğun gəlmir. Çünki əgər İmam Həsən (əleyhissəlam) Müaviyə ilə vuruşmaq fikrində deyildisə, bəs nəyə görə ordu toplayırdı? Halbuki bütün tarixçilər deyirdilər ki, İmam Həsən (əleyhissəlam) ordu toplayıb döyüşə hazır oldu. Lakin bir tərəfdən İmam əleyhissəlamın ordusundakı dəstəbazlıq və pərakəndəliklər, digər tərəfdən də Müaviyənin xaincəsinə qurduğu hiylələr nəticəsində İmam əleyhissəlamın nizami qoşunu döyüş başlamazdan qabaq və heç bir vuruş olmadan bir-birindən ayrıldı və camaat İmam əleyhissəlamın ətrafından dağıldı. İmam Həsən (əleyhissəlam) .da çarəsizlikdən döyüşməyib, sülhü qəbul etdi

Buna əsasən, İmam Həsən əleyhissəlamın hərəkəti qiyam, müharibə e'lan etmək və ordu toplamaqla başladı, sonra da vəziyyəti və İslam cəmiyyətinin şəraitini dərindən .yoxlayıb zamanın məsləhətinə uyğun olaraq şərti sülhlə nəticələndi

.İndi isə oxucuların nəzərini bu barədə daha geniş mə'lumata cəlb edirik



---

Usdul-Qabə fi mə'rifətis-səhabə, c.٢, səh.١٣-١۴; Əl-kamilu fit-tarix c.٣, səh.۴٠۶; ١ - ١ .Biharul-ənvar, c.۴۴, səh.٢١

### Əhdini danan camaat

Bir az bundan qabaq deyildiyi kimi İraq və Kufə camaatı sözübütöv və mütəşəkkil deyildi. Əksinə, onlar vəfasız, e’timad edilməyən və hər gün bir bayraq altında yığışan (külək hara əsdi, ora meyl edən), mövcud olan vəziyyətdən və zəmanənin qüdrətindən istifadə edən adamlar idi. Elə buna görə də, İmam əleyhissəlamın ordusunda yaranan böhran və hər iki tərəfin öz qoşunlarını səfərbər etməsilə həmzaman Kufənin adlı-sanlı qəbilələrinin başçılarından bir neçəsi İmam Həsən əleyhissəlama xəyanət edərək Müaviyəyə məktub yazıb bildirdilər ki, onlar onun hökumətini himayə edirlər. Onlar məktubla Müaviyəni məxficə İraqa tərəf hərəkət etməyə də’vət edərək söz verdilər ki, Müaviyə İraqa yaxınlaşan kimi ya İmam Həsən əleyhissəlamı tutub ona verəcək, ya .da ona sui-qəsd edəcəklər

Müaviyə həmin məktubları olduğu kimi İmam Həsən əleyhissəlama göndərib bildirdi (ki, bu cür insanlara arxalanıb döyüşə necə hazır ola bilərsən?(١

### Xain sərkərdə

İmam Həsən (əleyhissəlam) Müaviyə ilə döyüşmək məqsədi ilə Kufəni tərk etdikdən sonra Übeydullah ibn Abbası on iki min nəfərlik döyüşçü ilə ordunun ön hissəsinə, özünün ən yaxın dostlarından olan Qeys ibn Sə’d və Səid ibn Qeysi(٢) isə Übeydullaha müşavir və canişin tə’yin etdi. Belə ki, bu üç nəfərdən birinin başına bir iş gəlsəydi, .növbə ilə digəri onun işini görməli idi

İmam Həsən (əleyhissəlam) qoşunun hərəkət edəcək səmtini müəyyən edib belə göstəriş verdi ki, Müaviyənin qoşunu ilə rastlaşdıqda onların hərəkətinin qarşısını alıb (İmamı bu işdən xəbərdar etsinlər və İmam da əsas ordu ilə onlara qoşulsun.(٣

Übeydullah ibn Abbas öz ordusunu hərəkətə gətirdi. Onun ordusu Məskin adlı bir yerdə Müaviyənin ordusu ilə üz-üzə gəldi və Übeydullahın ordusu elə oradaca düşərgə saldı. Az bir zamanda İmama xəbər çatdı ki, Übeydullah Müaviyədən bir milyon dirhəm .alıb səkkiz min nəfərlə onun tərəfinə keçmişdir

Təbii ki, bu sərkərdənin xəyanəti vəziyyətin böhran içində olduğu belə bir vaxtda ordunun ruhiyyəsinin zəifləməsinə və İmam Həsən əleyhissəlamın nizami mövqeyinin

bir-birinə dəyməsinə çox böyük tə’sir göstərmişdi. Çox şücaətli, imanlı və Əli əleyhissəlamın ailəsinə qarşı vəfalı olan Qeys ibn Sə’d ordunun sərkərdəliyini öz öhdəsinə götürür və özünün ruhlandırıcı çıxışı ilə döyüşçülərin ruhiyyəsini artırmağa çalışır. Müaviyə onu da pulla ələ almaq istəyir, lakin Qeys ona aldanmayıb İslam düşmənlərinin qarşısında axıra qədər durur.(۴)

### Xaincəsinə görülmüş hiylələr

Müaviyə təkcə Übeydullahı ələ almaqla kifayətlənmədi. Eyni zamanda o, İmam əleyhissəlamın ordusunu zəiflətmək və ordu arasında şayiə yaymaq məqsədilə öz casus və muzdurlarını İmam əleyhissəlamın başçılıq etdiyi orduya göndərdi. Onlar İmam əleyhissəlamın başçılıq etdiyi orduda belə bir şayiə yaydılar ki, Qeys (ön xəttin



---

۱- [۱۷] Əl-İraşd, səh.۱۹۱.

۲- [۱۸] Yə’qubi öz kitabında Səid ibn Qeysin adını qeyd etməmişdir. Lakin digər tarixçilər onun adını yazmışlar.

۳- [۱۹] Məqatilut-talibin, səh.۴۰.

۴- [۲۰] Məqatitul-talibin, səh.۴۲.

başçısı) Müaviyə ilə saziş bağlayıb, eyni zamanda Qeysin də ordusu arasında şayiə yaydılar ki, İmam Həsən (əleyhissəlam) də Müaviyə ilə sülh bağlamışdır. İş o yerə çatdı ki, Müaviyə camaatın gözündə zahirən yaxşı olan adamlardan bir neçəsini İmam Həsən əleyhissəlamın hüzuruna göndərdi. Onlar gəlib Mədain düşərgəsində İmam əleyhissəlamla görüşdülər. İmam əleyhissəlamın çadırından kənara çıxdıqda, camaat arasında car çəkdilər ki, Allah Peyğəmbər (əleyhissəlam) nəvəsinin vasitəsi ilə fitnəni yatırtdı və müharibəni sakitləşdirdi. Həsən ibn Əli (əleyhissəlam) Müaviyə ilə sülh .edərək camaatın qanının tökülməsinin qarşısını aldı

Onlar özlərinə qarşı camaatın e'timadını doğrultduqlarına görə heç kim araşdırma aparmadan onların sözlərinə inanıb İmam əleyhissəlamın əleyhinə qiyam qaldıraraq o Həzrətin çadırına hücum edib çadırda nə var idisə, hamısını qarət etdilər. Hətta İmam .əleyhissəlamı öldürmək fikrinə də düşdülər. Ancaq sonradan hamı dağıldı

### Xəvaricin xəyanəti

İmam Həsən (əleyhissəlam) (ordu ilə birgə) Mədaindən Sabata tərəf hərəkət etdi. Yolda gizlənmiş və qabaqcadan İmam əleyhissəlamı güdən xəvaricdən biri o Həzrətə güclü bir zərbə endirdi. İmam Həsən (əleyhissəlam) bu zərbə nəticəsində ağır yaralanaraq çoxlu qan itirdi və zəiflədi. İmam əleyhissəlamın bir neçə yaxın dostu onu yenidən Mədainə qaytardı. Mədaində İmam əleyhissəlamın halı aldığı zərbə nəticəsində çox ağırlaşdı. Bundan istifadə edən Müaviyə vəziyyəti tam ələ aldı. Lazım olan nizami ordunu itirib tək qalmış İmam Həsən (əleyhissəlam) məcbur olub sülh təklifini qəbul etdi.(۱) Deməli, əgər İmam Həsən (əleyhissəlam) sülhü qəbul edibsə, bundan başqa çarəsi olmayıb. Necə ki, Təbəri və digər tarixçilər yazırlar: «Həsən ibn Əli (əleyhissəlam) yalnız ordusu onun başından dağılıb tək qaldığı halda sülhü qəbul (etməyə razı oldu.»(۲

### Sülhün səbəbləri barədə İmam Həsən əleyhissəlamın buyurduqları

İmam Həsən (əleyhissəlam) onun sülhünə e'tiraz edən bir nəfərin cavabında bu acı :həqiqətlərə işarə edərək öz sülhünün səbəblərini belə bəyan etdi

Mən hökuməti Müaviyəyə onunla vuruşmağa heç bir tərəfdarım olmadığından həvalə»

etdim, əgər tərəfdarım olsaydı, gecə-gündüz onunla vuruşub işi birdəfəlik həll edərdim. Mən Kufə camaatını yaxşı tanıyıram və onları dəfələrlə sınamışam. Onlar islah olunmayacaq azğın insanlardır. Nə vəfalıdırlar, nə də ki, iki nəfəri bir-biri ilə yola gedirlər. Onlar zahirdə bizə itaət edir, batində isə bizim düşmənlərimizlə əlbirdirlər.»(۳)

İkinci İmam öz dostlarının bu süstlüyündən və ona arxa olmadıqlarından çox narahat olmuş və bir gün çox şiddətli bir xütbə söyləmişdir. Xütbədə bə’zi məsələlərə işarə edib buyurmuşdur:

«Vay olsun sizlərə! Nə dinləri, nə də abır-həyaları olmayan adamlara təəccüb edirəm! Müaviyə məni öldürmək üçün sizə verdiyi və’dələrin heç birinə əməl etməyəcək. Əgər mən Müaviyəyə bey’ət etsəm, öz şəxsi vəzifələrimi indi olduğundan da yaxşı yerinə yetirərəm. Lakin hökumət Müaviyənin əlinə düşsə, o qoymayacaq mən öz cəddimin şəriətini cəmiyyətdə icra edim.

səh:۱۲

---

۱- [۲۱] Tarixi-Yə’qubi, c.۲, səh.۲۰۵.

۲- [۲۲] Tarixi-Təbəri, səh.۹۲; Usdul ğabə, c.۲, səh.۱۴.

۳- [۲۳] Biharül-ənvar, c.۴۴, səh.۱۴۷.

And olsun Allaha, (sizin xəyanətiniz səbəbindən) məcbur olub hökuməti Müaviyəyə təhvil versəm, yə'qin bilin ki, Bəni–Üməyyənin hökumət bayrağı altında heç vaxt üzünüz gülməyəcək və cürbəcür əzab-əziyyətlərlə rastlaşacaqsınız. İndi elə bil öz gözlərimlə görürəm ki, sabah sizin uşaqlarınız onların uşaqlarının qapısı qarşısında durub onlardan su, çörək istəyəcəklər. Hansı ki, həmin su və çörəyi Allah sizin uşaqlarınız üçün qərar verib və sizin uşaqlar onun həqiqi sahibidirlər. Bəni–Üməyyənin uşaqları onları öz qapılarından qovub öz haqlarından məhrum edəcəklər.»

Daha sonra İmam (əleyhissəlam) əlavə edib buyurdu:

«Əgər Allah düşmənlərinə qarşı mübarizə etmək üçün silahdaşlarım olsaydı, heç vaxt hökuməti Müaviyəyə təhvil verməzdim. Çünki hökumət Bəni–Üməyyəyə haramdır...»(١)

Müaviyənin çirkin hökumətinin mahiyyətini yaxşı tanıyan İmam Həsən (əleyhissəlam) bir gün Müaviyənin hazır olduğu bir məclisdə çıxış etmiş və çıxışında buyurmuşdur: «And olsun Allaha, nə qədər ki hökumət Bəni–Üməyyənin əlindədir, xoş həyat görməyəcəksiniz.»(٢)

Bu, tənbəllik səbəbindən və gələcəkdə rahat yaşamaq məqsədilə Müaviyə ilə mübarizə etməkdən boyun qaçıran İraq əhlinə bir xəbərdarlıq idi. Daha onların xəbəri yox idi ki, Müaviyənin hökumətində heç vaxt öz arzularına çatmayacaqlar.

### Sülh müqaviləsi və İmam Həsən əleyhissəlamın məqsədləri

İmam Həsən (əleyhissəlam) yuxarıda qeyd etdiyimiz səbəblərə görə Müaviyə ilə vuruşmağı İslam cəmiyyətinin ali məsləhətləri və İslamın qorunub saxlanmasının zərərinə görüb atəşkəs və sülhü qəbul etmək məcburiyyətində qaldığı üçün öz ali və müqəddəs məqsədlərini mümkün olduğu qədər sülh yolu ilə həyata keçirməyə çox çalışdı. Digər tərəfdən də Müaviyə sülhü bərqərar etmək və qüdrəti ələ keçirtmək üçün hər cür imkanatı İmam əleyhissəlamın ixtiyarında qoymuşdu. Hətta Müaviyə İmam (əleyhissəlam) üçün möhürlənmiş ağ bir kağız göndərib bildirdi ki, İmam (əleyhissəlam) ona nə yazsa, Müaviyə qəbul edəcək və razılıq əlaməti olaraq qabaqcadan öz möhrünü də vurmuşdu.(٣) İmam Həsən (əleyhissəlam) bu fürsətdən necə lazım idisə istifadə edərək İmam əleyhissəlamın ali məqsədlərindən hesab

olunan əsas və mühüm məsələləri sülh müqaviləsində yerləşdirdi və Müaviyənin dilindən sülh müqaviləsinə əməl edəcəyinə zəmanət aldı. Tarixi qaynaqlarda sülh müqaviləsinin mətni tam, mükəmməl və tərtiblə deyil, pərakəndə şəkildə verilmişdir. Hər tarixçi onun bə’zi maddələrini qeyd etmişdir. Ancaq bunların hamısını bir yerə yığdıqda, təxminən kamil şəkildə bir müqavilə düzəltmək olar. Kiçik bir baxışda İmam Həsən əleyhissəlamın sülh müqaviləsində qeyd etdiyi məsələlərə və onları həyata keçirməkdə etdiyi israr və tə’kidə nəzər salmaqla İmam Həsən əleyhissəlamın siyasi mübarizə zamanı düşməndən xal almaq üçün işlətdiyi fövqəl’adə tədbirini müşahidə .etmək olar

İndi sülh müqaviləsinin maddələrini ayrı-ayrılıqda araşdırmazdan qabaq beş maddədə .cəmlənmiş sülh müqaviləsinin hamısını əziz oxucuların nəzərinə çatdırırıq



---

۱- [۲۴] Cəlaul-uyun, c.۱,səh.۳۴۵-۳۴۶.

۲- [۲۵] Şərhi-Nəhcül-bəlağə (İbn Əbil Hədid), c.۳,səh.۴۰۵.

۳- [۲۶] Əl-Kamilu fit-tarix, c.۳, səh.۴۰۵; Əl-İstiab, c.۱,səh۳۷۱.

## Sülh müqaviləsinin mətni

Birinci maddə: Həsən ibn Əli (əleyhissəlam) hökuməti Müaviyəyə o şərtlə təhvil verir ki, Müaviyə hökuməti Qur'an qayda-qanunu və Peyğəmbərin (səlləllahu əleyhi və alih) .sünnəsi əsasında idarə etməlidir

İkinci maddə: Müaviyədən sonra hökumət Həsən ibn Əli əleyhissəlamın ixtiyarına keçməlidir. Əgər onun (İmam Həsən əleyhissəlamın) başına bir iş gələrsə, Hüseyn ibn Əli (əleyhissəlam) hökumət başına gələcək. Həmçinin, Müaviyənin özündən sonra .canişin tə'yin etməyə haqqı yoxdur

Üçüncü maddə: Əmirəlmö'minin Əli əleyhissəlama namaz qılarkən hörmətsizlik edib .onu söyməyin, lə'nətlənməyin qarşısı alınsın və o Həzrət yaxşılıqla yad edilsin

Dördüncü maddə: Kufə beytül-malında olan beş milyon dirhəm pul Müaviyənin hökumətinə verilməkdən istisna olunur və həmin pulu İmam Həsən əleyhissəlamın özü lazımi yerlərə sərf edəcək. Həmçinin, Müaviyə beytül-maldan ayrılan payda Bəni Haşimi Bəni Üməyyədən üstün tutmalıdır. Eləcə də Müaviyə Darabegərd şəhərinin xəracının bir milyon dirhəmini Əli əleyhissəlamın rəhbərliyi altında Cəməl və Siffeyn (döyüşlərində şəhid olanların ailələri arasında bölüşdürməlidir.(١

Beşinci maddə: Müaviyə bütün əhaliyə, istər Şam, istər İraq, istərsə də Hicaz əhalisinə hər hansı millətdən olursa olsun, bir daha tə'qib etməməsi və əzab-əziyyət verməməsi barədə zəmanət verməlidir. Onları Müaviyənin hökumətinə qarşı keçmişdəki fəaliyyətlərinə görə axtarışa mə'ruz qoymamalı, xüsusilə keçmiş kin-kudurətə görə İraq əhalisinə əziyyət verilməməlidir. Bundan əlavə, Müaviyə Əli əleyhissəlamın dostlarını harda olursa olsunlar amanda saxlamalı və onların heç birinə əziyyət etməməlidir. Əli əleyhissəlamın şiələrinin canı, malı və pulunun hörməti qorunmalıdır. Onlar əsla axtarışa mə'ruz qalmamalı və onlara zərrə qədər də narahatçılıq yetişməməlidir. Hər kəsin haqqı onun özünə çatmalıdır. Əli əleyhissəlamın şiələrindəki .beytül-mal onların özlərində qalmalıdır

Həmçinin, Həsən ibn Əli (əleyhissəlam) və qardaşı Hüseyn ibn Əli (əleyhissəlam) və eləcə də, Peyğəmbərin (səlləllahu əleyhi və alih) ailəsindən olan hər hansı bir şəxs

üçün Müaviyə tərəfindən heç bir xətər icad olmamalı, heç bir yerdə onlar üçün qorxu .hissi yaranmamalıdır

Müqavilənin sonunda Müaviyə maddələrin hamısına əməl edəcəyinə söz verərək .Allahı bu işdə şahid tutdu və bütün Şam ə’yan-əşrafı buna şəhadət verdilər

Beləliklə də, İmam Həsən (əleyhissəlam) hələ uşaq olarkən Peyğəmbərin (səlləllahu əleyhi və alih) gələcəkdən verdiyi xəbər həyata keçdi. Peyğəmbər (səlləllahu əleyhi və alih) bir gün İmam Həsən əleyhissəlamı (uşaq olarkən) minbərin başına çıxmış görüb buyurdu: «Mənim bu övladım müsəlmanların ağasıdır. Allah onun vasitəsilə iki (müsəlman dəstə arasında sülh yaradacaq.»(٢

### İmam Həsən əleyhissəlamın Müaviyə ilə sülh etməkdə məqsədi

Dünyanın böyük şəxsiyyətləri, ölkə başçıları vəziyyətin öz məqsədləri ilə zidd olduğunu görüb iki yol ayrıcına çatanda, çalışırlar işi elə həll etsinlər ki, ziyanı az olsun. Bu da .siyasi və ictimai gedişatda bir əsas kimi götürülmüşdür



---

.Biharül-ənvar, c.۴۴, səh.١٠ [٢٧] -١

Təzkirətül-xəvas, səh.١٩۴; Usdul-ğabə, c.٢, səh.١٢; Nurul əbsar, səh.١٢١ və Ət- [٢٨] -٢ .təbəqatul-kubra, c.١, səh.٢۶; Ənsabul-əşraf, c.٣, səh.۴٢

Bu məsələyə əsaslanaraq İmam Həsən (əleyhissəlam) da çalışırdı ki, öz yüksək məqsədlərini mümkün qədər tə’min etsin. Buna görə də, Müaviyə ilə sülh etmək məcburiyyətində qalanda müqavilənin birinci maddəsinə əsasən, hökuməti Müaviyəyə bu şərtlə təhvil verdi ki, Müaviyə hökuməti Qur’an qayda-qanunları və Peyğəmbərin (səlləllahu əleyhi və alih) sünnəsi əsasında idarə etsin. Mə’lumdur ki, İmam əleyhissəlamın məqsədi qüdrəti ələ almaq və İslam hökuməti təşkil verməklə yanaşı həm də cəmiyyətdə İslam qayda-qanununu qoruyub saxlamaq və cəmiyyətə bu qayda-qanun əsasında rəhbərlik etmək idi. Əgər bu qayda-qanun Müaviyə tərəfindən də icra olunsaydı, yenə İmam əleyhissəlamın məqsədi az da olsa tə’min olunardı. Buna əlavə olaraq ikinci maddəyə əsasən, Müaviyənin ölümündən sonra İmam Həsən (əleyhissəlam) İslam cəmiyyətinin rəhbərliyini azad şəkildə öz öhdəsinə götürə bilərdi. Müaviyənin otuz yaş İmam Həsən əleyhissəlamdan böyük olduğunu(١), o dövrdə artıq Müaviyənin qocalıq vaxtlarını keçirtməsini və adi halla onun ömrünün sonlarının yaxınlaşdığını nəzərə alanda, bu maddənin adi hesablamalar əsasında İslam və müsəlmanlar üçün nə qədər faydalı olduğu mə’lum olur. Müqavilənin digər maddələri də bu cür əhəmiyyət daşıyır. Çünki cümə namazında və eləcə də digər namazlarda Əli əleyhissəlamın rəsmi şəkildə heç bir qorxu olmadan lə’nətləndiyi, bu işin bir bid’ət kimi camaat arasında yayıldığı və Əli əleyhissəlamın şiə və dostlarının, eləcə də Peyğəmbərin (səlləllahu əleyhi və alih) ailəsinin (qohum-əqrəbasının) hər yerdə tə’qib olunduğu və tutularaq cürbəcür təzyiqlərə mə’ruz qaldığı bir dövrdə bu işlərin bundan belə təkrar olunmayacağı barədə maddə yazıb onu Müaviyəyə qəbul etdirmək və Müaviyənin onlara əməl edəcəyi və’dini onun dilindən almağın nə qədər böyük .nailiyyət olduğunu inkar etmək mümkün deyil

### Kufədə toplanış

Sülh müqaviləsi bağlandıqdan sonra tərəflər (İmam Həsən əleyhissəlamla Müaviyə) hərə öz ordusu ilə birlikdə Kufə şəhərinə gəlib şəhərin böyük məscidində bir yerə toplaşdılar. Camaat gözləyirdi ki, indi sülh müqaviləsinin maddələri hər iki tərəfin rəhbərliyinin iştirkı ilə camaat üçün oxunulacaq və daha onun icra olunacağında heç .kimin şəkk-şübhəsi qalmayacaqdır

Əlbəttə, camaatın bu intizarı heç də yersiz deyildi. Çünki camaat qarşısında çıxış etmək

sülh proqramının əsaslarından biri idi. Buna görə də, Müaviyə minbərə çıxıb xütbəyə başladı. Ancaq o, nəinki sülhün maddələrinə əməl edəcəyi haqqında söhbət etmədi, hətta tə’nə və təhqirlə dedi: «Mən sizinlə namaz qılıb həcc yerinə yetirmək, zəkat ödəmək üçün vuruşmadım. Mən bilirəm ki, onsuz da siz bunları yerinə yetirirsiniz. Mən sizinlə ona görə vuruşdum ki, sizi özümə tabe edib hökuməti ələ keçirəm.»

Daha sonra dedi: «Bunu bilin ki, Həsən ibn Əli əleyhissəlamla bağladığım sülh müqaviləsinin bütün maddələrini ayağım altına qoyub tapdalayıram və onların heç birinin dəyəri yoxdur.»(٢)

Beləliklə də, Müaviyə İmam Həsən əleyhissəlamla bağladığı sülh müqaviləsini ayağı altına saldı və onu açıqcasına pozdu.



---

١- [٢٩] Həsən ibn Əli əleyhissəlamın sülhü, səh.٢٧٨.

٢- [٣٠] Şərhi-Nəhcül-bəlağə (İbn Əbil Hədid), c.١۶, səh.١۵; İrşad (Şeyx Müfid), səh.١٩١.

## Müaviyənin cinayətləri

Müaviyə bu siyasəti yürütdükdən sonra öz işlərini düzəltmək əvəzinə əksinə, cinayətlərini daha da artırdı. O, Əli əleyhissəlama əvvəlkindən daha çox hörmətsizlik etməyə başladı. Yaşayışı, Əli əleyhissəlamın vəfalı, böyük dost və şiələrinə həddən artıq darısqallaşdıraraq Hicr ibn Ədiyy kimi İslamın böyük şəxsiyyətlərini qətlə yetirdi. Əli əleyhissəlamın şiələrinə yönələn qətl, işkəncə və əzab-əziyyəti daha da şiddətləndirdi. Belə ki, Əli əleyhissəlamın əksər dostları ya tutulub həbs edilir, ya dərbədər düşür, ya da öz ev-eşiklərindən uzaq düşüb sıxıntılı mühitdə yaşayırdılar. Müaviyə təkcə Əli (əleyhissəlam) və şiələrinin hörmətinin qorunması maddəsini pozmaqla kifayətlənməyib hətta Darabegərd məntəqəsinin xəracına da müqavilədə .olduğu kimi əməl etmədi

Təbəri bu barədə yazır: «Bəsrə əhalisi Darabegərdin xəracını verməyib dedi ki, bu mal (bizim beytül-malın olub və bizə məxsusdur.»(١

İbn Əsir yazır: «Bəsrə əhalisi Darabegərd məntəqəsinin xəracını verməkdən boyun (qaçırtdı. Onlar bu işi Müaviyənin göstərişi ilə etdilə r.»(٢

## Xalqın oyanıb xəbərdar olması

Bir çox ardıcıl döyüşlər nəticəsində artıq vuruşmaqdan yorulub öz tayfa başçılarının sözü, Müaviyənin təbliğatçılarının hiyləgər tabliğatı və yağlı və’dələri ilə sülh etməyə razılaşan camaat nə vaxtsa oyanmalı idi. Onlar döyüşə qarşı yorğunluq göstərməklə, Müaviyənin yalan və yağlı və’dələrinə inanmaqla və kor-koranə öz tayfa başçılarının sözü ilə sülhü qəbul etməklə necə böyük səhvə yol verdiklərini anlamalı idilər. Bu isə təkcə bir yolla – öz gördükləri işin acınacaqlı nəticələrini görməklə mümkün idi. Bundan əlavə, müsəlmanlar Əməvi hökumətinin əsl və həqiqi sifətini görməli, onların cəmiyyətdə yaratdıqları çətinlikləri, məhrumiyyətləri, ardıcıl axtarışları və zülmləri öz .gözləri ilə görməli idilər

İmam Həsən əleyhissəlamın və onun ən yaxın dostlarının o həssas dövrdə həyata keçirmək istədiyi məsələ o idi ki, bu hadisələri olduğu kimi camaata göstərsinlər, camaatın ağıl və düşüncəsi nəticəsində onları Əməvi hökumətinin bu cür acınacaqlı

işlərinin əleyhinə qiyama hazırlasınlar. Deməli, İmam Həsən (əleyhissəlam) sülh edibsə, bu ağır yükü boynundan atmaqdan ötəri sülh etməyib, əksinə ona görə sülh edib ki, mübarizəni başqa sahədə aparsın. Elə sülhdən sonra baş vermiş hadisələr də bu məsələyə kömək etdi və İraq əhalisini qəflət yuxusundan oyatdı. Təbəri yazır: «Müaviyə (sülh müqaviləsi bağlanandan sonra Kufə yaxınlığındakı) Nüxeylə adlı bir yerdə düşərgə saldı. Bu zaman xəvaricin bir dəstəsi Müaviyənin əleyhinə qiyam edib Kufə şəhərinə daxil oldu. Müaviyə Şam əhalisindən bir dəstəsini onlara qarşı vuruşmağa göndərdi, lakin xəvaric onları məğlubiyyətə uğratdı. Bundan sonra Müaviyə Kufə ordusuna xəbər göndərdi ki, xəvarici məhv etsinlər, əks təqdirdə Kufə əhalisi amanda olmayacaq.»(۳)

Beləliklə, Əli əleyhissəlamın və İmam Həsən əleyhissəlamın ordusunda vuruşmağa razı olmayan İraq əhalisi onların və xəvaricin müştərək düşməni olan Müaviyə tərəfindən xəvariclə vuruşmağa məcbur oldular. Bu da onu göstərir ki, camaat Müaviyənin hökumətində arzuladığı sülh və asayişə heç vaxt çatmamışlar.



---

۱- [۳۱] Tarixül-üməmi vəl-mülük, c.۶, səh.۹۵.

۲- Ə l-Kamilu fit-tarix, c.۳ səh.۴۰۵.

۳- [۳۳] Tarixül-üməmi vəl-mülük, c.۶, səh.۹۵.

### Qorxu içində saxlamaq və aclıq siyasəti

Bundan əlavə, Müaviyə camaata qarşı insaniyyətdən uzaq olan bir siyasət də yeridirdi. Bu siyasəti qorxu içində saxlamaq və aclıq siyasətindən başqa bir şey adlandırmaq olmaz. O, bu yolla İraq əhalisini həyat səhnəsindən götürürdü. Müaviyə bir tərəfdən İraq əhalisini hər cür çətinliklər qarşısında qoyur, digər tərəfdən də onları öz .hüquqlarından məhrum edirdi

Sünni məzhəbinin görkəmli alimi ibn Əbil Hədid yazır: «Harada şiə var idisə, qətlə yetirilirdi. Bəni–Üməyyə tərəfindən şiə olduğunu ehtimal verən şəxslərin əl-ayaqları kəsilirdi. Peyğəmbərin (səlləllahu əleyhi və alih) ailəsinə məhəbbəti olanların hamısı ya həbs edilir, ya mal-dövlətləri müsadirə olunur, ya da evi viran edilirdi. Şiələrə qarşı təzyiqlər o qədər artmışdı ki, Əli əleyhissəlamı sevmək nisbəti küfr nisbətindən pis sayılırdı və onun ardınca acınacaqlı əzablar gözlənilirdi. Kin-küdurət doğuran bu siyasətin icrasında Kufə şəhərinin vəziyyəti hər yerdən pis idi. Çünki Kufə Əli əleyhissəlamın şiələrinin mərkəzi hesab olunurdu. Müaviyə Ziyad ibn Süməyyəni Kufənin valisi tə’yin etdi, sonradan Bəsrənin də hökumətini ona tapşırdı. Bir vaxtlar Əli əleyhissəlamın şiələrindən olan Ziyad onları çox yaxşı tanıyırdı. O, şiələri harada gizlənmişdilərsə, tapıb öldürdüyünü öldürdü, bə’zilərini hədələyərək əl-ayaqlarını kəsdi, gözlərini çıxartdı, xurma ağaclarının budaqlarından asdırdı və onları İraqdan «.didərgin saldı. Belə ki, daha şiənin tanınmış şəxsiyyətlərindən heç biri İraqda qalmadı

### Kufə və Bəsrədə təzyiqlərin artması

Yuxarıda qeyd etdik ki, İraq əhalisi, xüsusən də kufəlilər hamıdan çox təzyiqlərə mə’ruz qalırdılar. İş o yerə çatmışdı ki, onlar öz e’tibarlı, inamlı dostlarının evinə get-gəl edib bir gizli söhbət etmək istədikdə, ev sahibinin xidmətçisindən qorxduqları üçün .ondan xəbərçilik etməyəcəyi barədə and almayınca sözə başlamazdılar

Müaviyə ölkənin bütün valilərinə məktub yazıb onlara tapşırdı ki, şiə və Əli .(əleyhissəlam) övladlarının şəhadətini də qəbul etməsinlər

O, məktubların birində belə yazır: «Əgər iki nəfər bir nəfərin şiə olduğuna şəhadət (verərsə, dərhal onun adını beytül-maldan silin və onu hüququndan məhrum edin.»(١

Növbə ilə altı ay Kufədə, altı ay Bəsrədə vali olan Ziyad Bəsrədə olmadığı dövrdə öz işlərini Səmürə ibn Cündəbə tapşırırdı. Səmürə bu müddətdə (altı ayda) səkkiz min nəfəri qətlə yetirdi. Ziyad ona dedi: Qorxmursan ki, onların arasında biri günahsız olar? ”.Səmürə dedi: “Onların iki bərabərini öldürsəm də, yenə qorxmaram

Əbu Səvar Ədəvi deyir: «Səmürə bir gün hamısı Qur’anı əzbərdən bilən qırx yeddi (qohumumu öldürdü.»(٢

**Sülh – Aşura hərəkatı üçün zəminə yaradan**

Bu qorxulu hadisələr İraq əhalisini möhkəm oyatdı və əhali Əməvi hakimiyyətinin əsl mahiyyətini az da olsa, tanıdı. Onlar artıq sakit oturmaqdan, süst qalmaqdan bezmişdilər. Tayfa başçılarının İmam Həsən əleyhissəlamın sülhündən istifadə edib Müaviyənin «səxavətindən» bəhrələndiyi bir vaxtda İraqın adi əhalisi öz ayaqları ilə



---

.Şərhi-Nəhcül-bəlağə (İbn Əbil Hədid), c.١١, səh.۴٣-۴۵ [٣۴] -١
.Tarixül-üməmi vəl-mülük, c.۶, səh.١٣٢ [٣۵] -٢

tərəfinə getmiş və öz əlləri ilə ona be’yət etmiş Müaviyənin zalım hökumətinin əsl .mahiyyətini yavaş-yavaş tanımağa başlayırdı

Müaviyə Müğeyrə ibn Şü’bəni Kufəyə, Abdullah ibn Amiri isə Bəsrəyə başçı tə’yin etdi. Osmanın ölümündən sonra Bəsrədən çıxıb getmiş Abdullah yenidən oraya qayıtdı. .Müaviyənin özü isə Şama gedib Dəməşqdə ölkə işlərinin tədbirinə başladı

İraq camaatı hər dəfə Əli əleyhissəlamın dövründəki yaşayışlarını yada saldıqda, qəmgin olur və Əli əleyhissəlamı himayə etmədiklərinə görə peşmançılıq çəkirdilər. Eləcə də, Şam əhalisi ilə bağladıqları sülhə görə peşman olmuşdular. Onlar bir-biri ilə rastlaşanda, bir-birini danlayır, bir-birindən soruşurdular ki, görəsən, nə olacaq, nə etməliyik? Sülhdən bir neçə il keçməmişdi ki, Kufə şəhərinin nümayəndələri İmam Həsən əleyhissəlamı görüb onunla söhbət etmək və onun sözlərinə qulaq asmaq üçün (Kufədən Mədinəyə get-gəl etməyə başladılar.(١

Bu əsasa görə İmam Həsən əleyhissəlamın sülh dövrü gələcək günə qədər camaatın azğın Əməvi hökumətinə qarşı hazırlıq və döyüş üçün məşq etmək dövrü hesab olur. .Elə bir gün ki, İslam cəmiyyəti artıq həmin gün mübarizə etmək üçün hazır olacaqdı

### Qiyam etmək üçün hazırlığı bildirmək

İmam Həsən (əleyhissəlam) sülh edəndə, hələ camaatın düşüncə tərzi o dərəcəyə çatmamışdı ki, İmam əleyhissəlamın məqsədini tə’min etsin. O zaman İslam cəmiyyəti arzu və istək zəncirlərinin əsiri idi. Bu həmin arzu və istək idi ki, camaatda məğlubiyyət ruhiyyəsi yaratmışdı. Buna görə də, İmam Həsən əleyhissəlamın qarşısında duran məqsəd camaatın fikrini Əməvi hökumətinə qarşı qiyama yönəltmək, camaata Əməvi hökumətinin həqiqi mahiyyətini başa düşüb fikirləşmək üçün fürsət verməkdən ibarət idi. Xüsusilə qeyd etmək lazımdır ki, İmam Həsən əleyhissəlamın Əməvi hökumətinin cinayət və zülmlərinə, onların Qur’an və İslam qayda-qanunlarını kəskin surətdə pozmasına işarə etməsi, camaatın fikrini tamamilə oyadırdı. Yavaş-yavaş bu oyanış artdı və İraqın böyük şəxsiyyətləri İmam Hüseyn əleyhissəlamın yanına gəlib ondan (qiyam etməsini istədilər.(٢

### Hadisələrin Mədinədə tə’siri

İmam Həsən əleyhissəlamın şəhadətindən sonra İmam Hüseyn (əleyhissəlam) İmamət məqamını öz öhdəsinə götürdü. Bu vaxtlar Müaviyənin törətdiyi cinayətlər Mədinədə səs-küyə səbəb olmuş və İmam Hüseyn əleyhissəlamın böyük şiə şəxsiyyətləri ilə İraq, Hicaz və başqa yerlərdə təşkil etdiyi ictimai yığıncaqların əsas söhbətinə çevrilmişdi. Məsələn, Müaviyə Hicr ibn Ədiyy və onun yol yoldaşlarını öldürdükdən sonra Kufənin adlı-sanlı şəxsiyyətlərindən bir neçəsi İmam Hüseyn əleyhissəlamın yanına gedərək məsələdən onu xəbərdar etdilər. Bu xəbərin yayılması .ilə bütün mö’minlər arasında hökumətə qarşı böyük nifrət hissi oyandı

Bu məsələdən mə’lum olur ki, artıq o vaxtlar Əməvi hökumətinə qarşı müntəzəm olaraq müxalifətlər irəli sürülürdü. Bu müxalifətin təbliğatçıları və əsas aparıcı qüvvələr İmam Həsən əleyhissəlamın sayca az olan ən



---

.Əli (əleyhissəlam) və övladları, səh.۲۰۷ [۳۶] -۱

İmam Hüseyn (əleyhissəlam) yanına gələnləri İmam Həsən əleyhissəlamın [ ۳۷] -۲ yanına göndərərək bildirirdi ki, indi ayağa qalxmaq vaxtı deyil. Nə qədər ki, Müaviyə .sağdır, inqilab heç cür baş tutmayacaq

yaxın dostları idi. İmam Həsən (əleyhissəlam) öz ağıllı tədbiri ilə onların canını Müaviyənin apardığı çirkin bəlasından qoruyub saxlamışdı. Bu azsaylı dəstənin məqsədi o idi ki, qiyamın yetişməsi və camaatı qiyama hazırlamaq məqsədilə Müaviyənin hakimiyyəti dövrü ərzində törətdiyi bütün cinayətləri camaatın yadına (salsın.(١

**Nəyə görə İmam Həsən (əleyhissəlam) sülh, İmam Hüseyn (əleyhissəlam) isə qiyam ?etdi**

Ötən araşdırmalarda İmam Həsən əleyhissəlamın sülhünün səbəblərini aydınlaşdırdıq. Burada belə bir sual irəli gəlir ki, nəyə görə İmam Həsən (əleyhissəlam) sülh, İmam Hüseyn (əleyhissəlam) isə qiyam etdi? Əgər sülh etmək düzgün fikirdisə, bəs onda nəyə görə İmam Hüseyn (əleyhissəlam) Yezidlə sülh bağlamadı? Yox əgər vuruşmaq ?lazım idisə, onda nəyə görə İmam Həsən (əleyhissəlam) vuruşmadı

Bu sualların cavabını bu iki böyük İmamın yaşadığı müxtəlif şəraitli dövrdə və Yezidlə Müaviyənin rəftarında axtarmaq lazımdır. İndi Müaviyə ilə Yezidin rəftarındakı fərqli .cəhətlər haqqında az da olsa, sizə mə'lumat veririk

**Müaviyənin baş aldatmaları**

Müaviyə hakimiyyəti dövründə avam, aldadıcı plan və siyasətlərlə öz hökumətini şər'i və İslami bir hökumət kimi göstərməyə çalışırdı. O, camaatın fikrini onun hökumətinin həqiqi İslam siyasətindən kənar olduğunu anlamaqdan yayındırırdı. Düzdür, Müaviyə əməldə İslamı təhrif etmiş və əsl İslam hökumətinin yerinə Əməvi hakimiyyətini gətirib çıxarmaqla İslami cəmiyyəti qeyri-İslami cəmiyyətə çevirmişdi, lakin bununla belə yenə də İslamın zahirinə əməl edir, zahirdə İslam qayda-qanunlarına riayət edirdi. Arada olan pərdələri cırmırdı, sarayında azca da olsa, İslamın zahiri qayda-qanunlarını dəyişməyə qoymurdu. O, çox yaxşı bilirdi ki, din və İslam xilafəti adı ilə camaata başçılıq edir. Buna görə də, aşkarda elə bir iş görməməli idi ki, camaat o işi dinə qarşı mübarizə kimi qələmə versin. Çünki Müaviyə də elə bu dinə əsasən, camaata rəhbərlik edirdi. Əksinə, o tutduğu mövqeyə uyğun olaraq həmişə öz əməllərini din çərçivəsində yerləşdirirdi. İslam və din qayda-qanunlarına uyğun .olmayan işləri isə gizlində görürdü

Bundan əlavə, Müaviyə çətinlikləri həll etməkdə və müşkülatı yoluna qoymaqda fövqəl'adə bir siyasət işlədirdi. Çətinlikləri xüsusi yollarla həll edirdi. Ancaq Yezid bu cür siyasət yeritmirdi. Elə bu iki səbəbə görə Müaviyənin hakimiyyəti dövründə qiyamın qələbə ilə nəticələnməsi və şəhadətin müsbət tə'sir verəcəyi sual altında qalırdı. Çünki camaat o vaxt Əməvi hakimiyyətinə qarşı qiyam etməyi düzgün hesab etmirdi. O vaxt camaatda Əməvi hakimiyyətinə qarşı hələ nifrət hissi oyanmamışdı. Cəmiyyətin ümumi fikri Müaviyənin İslamdan kənar olduğunu hələ anlamadığına görə, bə'zi gözlənilməz ünsürlər səbəbindən İmam Həsən əleyhissəlamın Müaviyə ilə mübarizəsi haqqın batilə qarşı mübarizəsi kimi yox, hakimiyyət uğrunda mübarizə kimi hesab olunurdu. Belə bir vaxtda şəhid olmaq qiyamın məqsədlərini irəli aparmaqda heç bir kömək etməz, camaatın ümumi rə'yi səhv formalaşar və bununla da, həqiqət heç .olardı

**Münasib olmayan mühit**

Yuxarıda qeyd etdik ki, Müaviyənin dövründəki siyasi vəziyyət elə bir halda deyildi ki, bir nəfər islahedici müəyyən bir yolla işi həll edə bilsin. Cəmiyyət öz ağlı ilə öz yolunu .tə'yin edə biləcək səviyyədə deyildi



---

.İmam Hüseyn (əleyhissəlam) inqilabının araşdırılması, səh.۱۷۸-۱۷۹ [۳۸] -۱

Əksinə, onda vəziyyət elə idi ki, o vəziyyətdə hər hansı bir islahedici fəsad rəhbərlərin əməllərini gözləməli, fürsət düşdükdə öz imkanlarını, ətrafdakıları və düşmənlə mübarizəsini nəzərə almaqla əks tədbirlər görməli idi. Bununla da, “məğlub olmuş həqiqət”ə “qalib gəlmiş yalan” qarşısında qələbə qazandırmalı idi. İmam Həsən əleyhissəlamın dövründəki əsas müşkül də elə bu idi. O dövrdə şəhadət lazımi şərait istəyirdi ki, fərdi şəhadətdən çıxıb ictimai şəhadətə çevrilsin. Şəhidin qanı camaatda .yeni fikir yaratmalı idi

Tarixi faktlar göstərir ki, İmam Həsən (əleyhissəlam) onun ətrafına toplaşmış süst ordu ilə (onların gördükləri bə’zi işləri sizin nəzərinizə çatdırmışıq) ayağa qalxıb Müaviyə ilə vuruşsaydı, onu tezliklə bir qəhrəman kimi şəhid etməzdilər. Onu əsir tutardılar. Müaviyə istəyirdi ki, özünün və ailəsinin (qohum-əqrabasının) İslam ordusu qarşısında rüsvayçılığını və bu orduu tərəfindən əsir olunmalarının əvəzini Məhəmmədin (səlləllahu əleyhi və alih) ailəsinin böyüklərindən birini əsir tutmaqla çıxsın. Deməli, əgər İmam Həsən (əleyhissəlam) məğlub olsaydı, qəhrəman bir şəhid kimi (Aşurada olduğu kimi) öldürülməz, Müaviyə tərəfindən əsir olar və nəhayət müəmmalı şəkildə öldürülərdi. Bu da o dövrdə haqqa dəyəcək böyük bir ziyan olardı. Əgər İmam Həsən əleyhissəlamın ordusu Müaviyənin ordusu ilə döyüşdə məğlub olsaydı, Müaviyənin ordusu müsəlman şəhərlərinə hücum edib bacardığı qədər əhalini qırardı. Xüsusilə də, Həzrət Əli (əleyhissəlam) və İmam Həsən əleyhissəlamın tabeçiliyində olan Məkkə, Mədinə, Kufə, Bəsrə və digər şəhərləri talan edərdi. Beləliklə də, ölənlərin sayı Kərbəladan fərqli olaraq məhdud qalmaz və həddi aşıb-daşardı. (İmamın qarşısını aldığı hədər qanın tökülməsi də elə bu idi.(١

Bəlkə də elə bu səbəblərə görə (və İmam Hüseyn əleyhissəlamın İmam Həsən əleyhissəlamın sülhünə razılıq bildirmək məqsədilə) İmam Hüseyn (əleyhissəlam) qardaşının şəhadətindən sonra Müaviyənin son on il hakimiyyəti dövründə, yə’ni, təxminən hicrətin əllinci ilindən altımışıncı ilinədək qiyam etmədi. İmam Hüseyn (əleyhissəlam) o vaxt münasib fürsətin ələ düşməsi üçün günləri sayır və camaatın ümumi fikrini oyatmaqla kifayətlənirdi. Çünki İmam Hüseyn (əleyhissəlam) əgər o vaxt qiyam etsəydi, bu qiyam İslam cəmiyyətində necə nəticələnəcəyi və camaatın fikrində .necə cilvələnəcəyi mə’lum deyildi

## Yezid – İslam cəmiyyətinin nifrətamiz siması

Yuxarıda dediyimiz məsələlər Yezid barəsində tamamilə əksinədir. Çünki Yezidin, həm atası Müaviyənin yeritdiyi siyasətdən başı çıxmırdı, həm də din adı altında camaata .rəhbərlik etdiyi İslam dininin zahirindən də çox uzaq idi

Yezid hələ bişməmiş, şəhvətpərəst, özbaşınalıq edən, ehtiyat və uzaqgörənlikdən uzaq olan bir gənc idi. O, ağılsız, qorxusuz, kefcil, əyyaş və çox aşağı səviyyəli fikir .düşüncəsinə malik olan bir adam idi

Hakimiyyətə gəlişindən qabaq həvayi-nəfsinin qulu və dünya təmayüllü Yezid hakimiyyətə gəldikdən sonra da, atasından fərqli olaraq heç İslamın zahirinə də əməl etmirdi. O, hətta zahirdə də özünü dindar və imanlı bir şəxs kimi göstərmirdi. Əksinə, qorxusuzluğu nəticəsində İslamın zahiri qayda-qanunlarını da pozur və şəhvətini doyuzdurmaqdan ötrü əlindən gələni edirdi. O, açıq-aşkar şərab içir və açıqcasına fitnə-fəsad törədirdi. Yezid siyasi nöqteyi-nəzərdən o qədər zəif idi ki, İslamla barışmaz düşmən olan və cahiliyyət dövrünü xatırladan Bəni–Üməyyə hakimiyyətinin əsl mahiyyətini camaata aşkar etdi. Yezidin bu qanun pozuntuları və işlərə laqeyd



---

.İmam cəmiyyət gözündə, səh.۱۲۱, ۱۳۳, ۱۷۱ ۱ -۱

yanaşması artıq onun xilafət məqamını qoruyub saxlamağa ləyaqəti olmadığını və müsəlmanların rəhbəri olmasına səlahiyyəti çatmadığını hamıya sübut etmişdi. Buna əsasən, Bəni–Üməyyə hakimiyyətinin muzdurları İmam Hüseyn əleyhissəlamın qiyamını camaatın fikrində müttəhəm edə bilməzdilər. Çünki camaat Yezidin dini qayda-qanunlarla heç cür uyğunluğu olmayan işlərini öz gözləri ilə görürdü. Elə Yezidin bu rəftarı onun hökumətini devirmək üçün qiyam etmək fikrini camaatda oyatmaq üçün mühüm amil hesab olunurdu. Belə bir dövrdə camaat İmam Hüseyn əleyhissəlamın qiyamını siyasi ixtilaf və vəzifə üstündə mübarizə kimi yox, Peyğəmbər (səlləllahu əleyhi və alih) balasının İslamı qorumaq məqsədilə batil hökumət əleyhinə .mübarizəsi kimi qələmə verirdi

### Qiyamçılar qüvvə toplayır

İmam Hüseyn əleyhissəlamın qiyamının başqa bir səbəbini də, İmam Həsən əleyhissəlamın sülhündən sonra şiələrin də'vətinin genişlənməsində və ümumi fikrin oyanmasında axtarmalıyıq. Çünki İmam Həsən əleyhissəlamın sülhündən sonra Əməvi hökumətinə qarşı yaranmış hərəkat günbəgün artır və hərəkatın dairəsi genişlənirdi. Müaviyənin də siyasəti istər bilərəkdən, istərsə də, bilməyərəkdən bu hərəkatın genişlənməsinə gətirib çıxarmışdı. Çünki İmam Həsən əleyhissəlamın şəhadətindən sonra meydanı bir az açıq görən Müaviyə get-gedə vəziyyəti camaata (xüsusən də, Əli əleyhissəlamın şiələrinə) çətinləşdirir və əlindən gələn zülmü edirdi. Müaviyənin müsəlmanların hüquqlarına dəfələrlə təcavüz etməsi və onun ordusunun günahsız insanları qırması, yaxud əziyyət verməsi, sülh müqaviləsini pozması, sülh müqaviləsində qeyd olunanın əksinə olaraq özündən sonra Yezid üçün vəliyyi-əhd adı ilə camaatdan bey'ət alması, nəhayət İmam Həsən əleyhissəlamı zəhərləməsi Bəni–Üməyyə hakimiyyətini daha da ləkələyən və onun mövqeyini bir qədər də zəiflədən məsələlər idi. Bu hadisələr şiələrin birləşməsi və Əməvi hökumətinə qarşı cəbhənin güclənməsinə və tədricən İmam Hüseyn əleyhissəlamın qiyamının başlanmasına .səbəb oldu

Görkəmli Misir alimi və yazıçısı doktor Taha Hüseyn sülh müqaviləsindən sonra Müaviyənin şiələri tə'nə və tənqid etməsini qeyd edərək yazır: «Müaviyənin son on il hakimiyyəti dövründə şiələrin işi artdı və onların də'vəti İslam ölkəsinin Şərqində və

ərəb məntəqələrinin Cənubunda həddən artıq yüksəliş tapdı. Belə ki, Müaviyənin ölümü zamanı camaatın əksəriyyəti, xüsusən də, İraq əhalisi Müaviyəni lə'nətləməyi və Əhli-beyt məhəbbətini özlərinə bir dini vəzifə kimi hesab edirdi.»(۱) Beləliklə də, İslam cəmiyyəti Əməvi hökumətinin həqiqi simasını kifayət qədər tanıdı. Onlar bu hökumətin işkəncələrini kifayət qədər daddılar və bu hökumətin müsəlmanların hüquqlarına etdiyi təcavüz və zülmləri gördülər. Bu hökumətin Müaviyənin hakimiyyəti dövründə üzünə keçirdiyi üzlük kənara çəkilərək camaat onun həqiqi qiyafəsini tanıdı. Bunun da nəticəsində Müaviyənin ölümü və İslam cəmiyyətinin oyanması ilə Müaviyənin dövründə baş tutacaq bir qiyama mane olan səbəblər aradan qaldırıldı və Əməvi hökumətinə qarşı qiyam üçün yol açıldı. Belə bir vaxtda Hüseyn ibn Əli (əleyhissəlam) azğın Bəni–Üməyyə hökumətinə qəti zərbə endirərək o böyük və .misilsiz qiyamı həyata keçirtdi

### İlhamverən qiyam

İmam Hüseyn əleyhissəlamın qiyamı cəmiyyətdə böyük dönüş yaradaraq vəziyyəti dəyişdirdi. Bütün fikirləri Əməvi hökumətinə qarşı yönəldərək «Təvvabin» qiyamı, ,Mədinə əhalisinin qiyamı, Muxtari-Səqəfinin qiyamı



---

Əli (əleyhissəlam) və övladları, səh.۲۹۸ ۱ -۱

Zeyd ibn Əli ibn Hüseyn əleyhissəlamın qiyamı və bir neçə başqa ardıcıl qiyamlara səbəb oldu. Əgər bu qiyam İmam Həsən əleyhissəlamın dövründə və o Həzrətin .başçılığı altında həyata keçsəydi, heç bir nəticəsi olmayacaqdı

İmam Hüseyn (əleyhissəlam) həqiqətdə öz əziz qardaşının tutduğu proqramla irəliləyirdi. Çünki İmam Həsən (əleyhissəlam) son dərəcə vüqarla kütbeyin insanların səhvlərinə dözərək o dövrün həqiqətlərinin üstü-örtülü olması nəticəsində sülh imzalamaqla yavaş-yavaş qiyam üçün zəminə yaradaraq camaatın beynində inqilabi fikirlər oyatdı. Elə ki şərait tamamilə hazır oldu, Hüseyn ibn Əli (əleyhissəlam) fəsad .mərkəzinə hücumun rəhbərliyini öz öhdəsinə götürdü

### Tərəfdarların fərqi

İmam Həsən əleyhissəlamla İmam Hüseyn əleyhissəlamın yaşadığı dövr arasındakı fərqdən əlavə, bu iki İmamın tərəfdarları arasındakı fərqi də nəzərə almaq lazımdır. İrəlidə qeyd etmişdik ki, İmam Həsən əleyhissəlamın ordusu bir şayiə eşitməklə bir-birinə dəydi və bə’ziləri İmamın çadırına hücum edərək hətta onun ayağı altındakı xalçanı da qarət etdilər. İmamla Şam ordusuna qarşı vuruşmaq və bu yolda can vermək istəyənlərin özləri fitnə yaradaraq İmamı tək qoydular. İndi onları İmam Hüseyn əleyhissəlamın tərəfdarları ilə müqayisə edin. İmam Hüseyn əleyhissəlamın tərəfdarları Aşura gecəsi (Tasua günü) (İmam Hüseyn əleyhissəlama) deyirdilər: «And olsun Allaha, əgər bilsək ki, öldürüləcəyik, sonra bizi dirildib yenə öldürərək yandırıb külümüzü küləyə verəcəklər və bu işi yetmiş dəfə təkrarlayacaqlar, sənin yolunda can verməmiş yenə səndən ayrılmarıq. Ölmək ki, bir dəfədən çox deyil! Özü də şəhadətə «!yetişmək kimi ölmək. Bu, əbədi səadət və izzətdir

Bəli, bu cür insanlarla bəşəriyyət tarixində «şəhadət» adlı bir şövq, göylərdə «Aşura» adlı bir zümzümə yaratmaq olar. Lakin o cür şəxslərlə (İmam Həsən əleyhissəlamın dövründəki adamlarla) nə qələbə mümkündür, nə də şəhadət. Onlar adamı əl-qolu bağlı düşmənə təhvil verər və adama əsirlik zillətindən başqa heç bir şey nəsib etməzlər. İmam Həsən əleyhissəlamın mübarizə səngərini dəyişməsinin səbəbi də elə bu idi. Başqa sözlə desək, İmam Həsən (əleyhissəlam) mübarizə məqsədini yox, formasını dəyişdi. Elə bil ki, nəqliyyat vasitəsi gedə-gedə namaz qılan şəxs nəqliyyat

vasitəsi sağa-sola dönərkən o da yerini dəyişir, ancaq cəhəti (qibləyə tərəf durmaq) olduğu kimi qalır. Haqq tərəfdarlarının məqsədi də daima batilə qarşı mübarizə etmək olub. İstər bu mübarizə Aşurada (Kərbəla çölündə), istər Kufənin məhəllə və küçələrində, istər Mədinə məscidində, istər Bağdad zindanında və istərsə də ayrı .yerlərdə olsun

İmam Həsən (əleyhissəlam) o dövrdə haqq-ədalətin yayılmasına böyük mane olan Müaviyəni hədəf tutmuşdu. Bu ali məqsədə gah ordu hazırlamaqla yetişmək istəyir, (gah da sülhü qəbul etmək tədbiri ilə.(۱)

### Bir vəzifənin iki tərəfi

Mücahid Əllamə Seyyid Şərəfüddin Amili görkəmli alim Şeyx Razi Ali-Yasinin çox də «yərli olan «Sülhül-Həsən

İmam Həsən əleyhissəlamın sülhü) adlı kitabına yazdığı ön sözdə deyir: «İmam Həsən) əleyhissəlamınən

əsas məqsədi o idi kį cəddi Peyğəmbərin (səlləllahu əleyhi və alih) dinini aradan aparmaq üçün çə kilmiş

planların qarşısını almaq üçün bu zalımların üzündə ki pərdəni götürüb onları camaata olduğu kimi tanıtdırsın. İmam bu

məqsədinə tam şəkildə nail oldu. Əməvilərin çirkin üzündə ki pərdə götürüldü və onların hə qiqi siması aş kar

oldu. (Bu ne’mə tə görə Allaha şükr olsun!) İmam Həsən əleyhissəlamın bu tədbirinin nəticə sində qardaşı



---

.İmam cəmiyyətin gözündə, səh.۱۲۹-۱۳۰ ۱ -۱

İ mam Hüseyn (ə leyhissə lam) hə qiqə ti üzə çıxaran və ağ ıl sahiblə rinə ibrə t də rsi olan o böyük inqilabı hə yata

keçirtdi. Bu iki qardaş bir iş in iki tə rə fi idi. Hə r birinin öz iş i və öz və zifə si yerində. özünə mə xsus ş ə raitdə bu

iş i icra etmə k və çə tinliklə rə dözmə k baxımından, elə cə də fə dakarlıq və canfə ş anlıq göstə rmə k baxımından

bir-biri ilə tam uyğ un gə lir. İ mam Hə sə n (ə leyhissə lam) öz canını bu yolda qurban vermə kdə n ə sirgə mə di.

İ mam Hüseyn (ə leyhissə lam) Allah yolunda canından keçmə kdə heç də İ mam Hə sə n ə leyhissə lamdan irə li deyil.

Ə sas mə sə lə budur ki, İ mam Hə sə n (ə leyhissə lam) öz canını sakit və aram cihadda (soyuq müharibə də ) qurban

verdi. Elə ki, sükutu qırmağ ın vaxtı yetiş di, Kə rbə la ş ə hadə ti meydana çıxdı. Elə bir ş ə hadə t ki, İ mam Hüseyn

ə leyhissə lamın baş ına gə lmə zdə n qabaq İ mam Hə sə n ə leyhissə lamın baş ına gə lmiş di.

Nəzər sahibləri olan düşüncəli insanların fikrincə Sabat günündəki fədakarlıq hadisəsi Aşura gününün hadisəsindən daha artıq olmuşdur. Çünki İmam Həsən (əleyhissəlam) həmən gün fədakarlıq səhnəsində səbirli və dözümlü bir qəhrəman rolunu məğlub olub əldən düşmüş bir şəx simasında oynadı. Buna görə də, Aşura şəhadəti ilk növbədə İmam Həsən əleyhissəlama sonra isə İmam Hüseyn əleyhissəlama yetişmişdi. Çünki Aşura hərəkatının əsas banisi İmam Həsən (əleyhissəlam) olmuş, İmam Hüseyn (əleyhissəlam) isə onu sona çatdırmışdır. İmam Həsən əleyhissəlamın qiyamının həqiqəti, öz səbr və hikməti sayəsində aşkar etməyə bağlı idi. İmam Hüseyn əleyhissəlamın parlaq qələbəsinin səbəbi də, məhz həqiqətin bu cür aşkara çıxması idi. Elə bil ki, İmam Həsən əleyhissəlamla İmam Hüseyn (əleyhissəlam) (İslamın ziddinə olan Əməvi hökumətinin əsl mahiyyətini aşkar etmək və camaatı qəflət yuxusundan

oyatmaq üçün) müttəfiq olaraq bir proqram əsasında hərəkət etmiş və hər biri bir rolda çıxış etmişlər. Təkcə fərq budur ki, İmam Həsən (əleyhissəlam) öz rolunu hikmətli səbr əsasında, İmam Hüseyn (əleyhissəlam) isə mərdcəsinə qiyam etmək əsasında ifa etmişdir. Beləliklə də, bir məqsədə çatmaq üçün mükəmməl bir taktika yaranmışdır. Sabat və Kərbəla hadisəsindən sonra camaat oyanıb hadisələr və vəziyyətin gedişi haqqında və Bəni–Üməyyə hakimiyyətinin əsl mahiyyəti barədə (fikirləşməyə başladı.»(١)

Bu hə qiqə tlə ri nə zə rə alaraq deyə bilə rik kị ə gə r İ mam Hüseyn (ə leyhissə lam) öz ə ziz qardaş ı İ mam

Hə sə n ə leyhissə lamın vaxtındakı ş ə raitdə olsaydı̣ eynilə İ mam Hə sə n ə leyhissə lamın gördüyü iş i

görə cə kdi. Elə cə də , İ mam Hə sə n (ə leyhissə lam) İ mam Hüseyn ə leyhissə lamın yerində olsaydı, eynilə

İmam Hüseyn əleyhissəlamın gördüyü işi görəcəkdi. Çünki bu iki İmam hərə öz vaxtının şəraitinə uyğun olaraq

.öz vəzifələrini yerinə yetirmişlər

İslam peyğəmbəri bu hadisələri nəzərə alaraq öz uzaqgörənliyi ilə bu iki övladı barə də :buyurmuş dur

Həsən (əleyhissəlam) və Hüseyn (əleyhissəlam) İ slamın iki İ mamıdırlar. İ stər sülh» (etsinlər̦ istərsə də qiyam.»(٢)

### ?Sülh yoxsa məsləhət

Bu bölmə ni Tehran ş ə hə rində çap olunmuş «Günün qadını» jurnalından götürülmüş «Sülḥ yoxsa mə slə hə t?» adlı

.baş lıqla yekunlaş dırırıq

İ mam Hə sə n ə leyhissə lamın sülhünụ baş qa sözlə desə k, Müaviyə ilə bağ ladığ ı atə

, ş kə si bə lkə də

İ slam dünyasında İ mamə t mə qamının ə n çə tin mə rhə lə lə rində n biri kimi adlandırmaq olar. Tarixin bu inqilabi



---

۱- ۲۱-۲۰.İmam Həsən əleyhissəlamın sülhü, sə h.

۲- ۳۹۴.Mənaqibi-Ali-Əbutalib, c.۳ səh.

hə rə kə ti və onun insanı üzə n çə tinliklə rinə dözmə k hə miş ə mübahisə lə r törə tmiş və suallara sə bə b

olmuş dur. Bu hadisə nin acınacaqlı çə tinliklə rinə Hə zrə t Ə li ə leyhissə lamın oğ lu İ (mam Hə sə n (ə leyhissə lam

imana nisbə t öz ali mə qamı ilə dözmüş, ondan baş qa heç kə s bunlara dözmə miş və dözə də bilmə z. Ancaq

tə ə ssüflə r olsun ki, qə rə zi olanlar qə rə z mə qsə di ilə, cahillə r də öz nadanlıqları nə ticə sində bu cür iman

.ə sasında çə kilmiş planı tə hrif etmiş və pis mə ’nalara yozmuş lar

İ mamların hamısı tə qva nümunə si və hə rə nin özünə mə xsus yolu olmuş dur. Tə qva hamısında müş tə rə k

.cə hə t olmuş, yolları isə bir-birində n fə rqlə nmiş dir

Ə li ə leyhissə lamın seçdiyi yol iki hissə də n – sükut və qiyamdan tə ş kil olmuş və .ümmə ti qabağ a aparmış dır

İ mam Hə sə n ə leyhissə lamın yolu birinci mə rhə lə də, İ mam Hüseyn ə leyhissə lamın yolu isə ikinci

mə rhə lə də atalarının yolu kimidir. Ə li (ə leyhissə lam) sükut etmə də n qiyam edib xə bə rdaredici və hə yatverə n

ş ə hadə tə çatmazdı. İ mam Hüseyn ə leyhissə lamın da fə ryadı və canfə ş anlığ ı qardaş ının sülhü olmadan özünü

.tarixə sala bilmə zdi

İ mam Hə sə n ə leyhissə lamı öz sağ lamlığ ını güdə n bir ş ə xs kimi fikirlə ş ə nlə r və elə cə də , ş ur və

hə yə can nə ticə sində İ mam Hə sə n ə leyhissə lamın da ş ə hadə ti seçib Sabatda

(Sabat sülh müqavilə si bağ lanan

yerin adıdır. Onunla ə laqə dar olaraq sülh bağ lanan günün də adı Sabat günü adlandırılmış dır. İ mam Hə sə n

ə leyhissə lamın bu sülhü inqilabi və tarixi bir hadisə olmuş. baş qa sözlə desə k, İ mam Hə sə n ə leyhissə lamın

Aş urası olmuş dur.) yeni bir Aş ura. Kufə də yeni bir Kə rbə la yaratmasını .arzulayanların hamısı sə hv fikirdə dir

**Yol seçmək mübarizənin ən əsas cəhətidir**

Ola bilsin ş ə hadə tə dözmə k İ mam Hə sə n (ə leyhissə lam) üçün daha asan olardı. Ancaq o da, tə kcə İ slam və

müsə lmanları fikirlə ş mə li və mübarizə nin ə n ə sas yolunu seçmə li idi. Bir az fikirlə ş dikdə , görürük ki. İ mam

Hə sə n ə leyhissə lamın dövründə sülhdə n baş qa heç bir yol yox idi. O da ancaq yaxş ı ölmə k və mə qsə də çatmaq

üçün idi. Ə gə r İ mam Hə sə n (ə leyhissə lam) tə k qaldığ ı bir dövrdə qardaş ı kimi ,qiyam edib ş ə hid olsaydı

İ mamə t xə tti qırılardı. Ə gə r İ mam Hə sə n ə leyhissə lamın da qardaş ı Hüseyn (ə leyhissə lam) kimi yetmiş iki

dostu olsaydı. bə lkə o da, İ mam Hüseyn (ə leyhissə lam) kimi qiyam edə rdi. Ancaq düş mə n onun ordusunu baş ından

uzaqlaş dırdığ ı və hə tta İ mam ə leyhissə lamın öz arvadını onu zə hə rlə mə k üçün razı saldığ ı. İ mam

ə leyhissə lamın ordusunun baş çılarını İ mam ə leyhissə lamı qolubağ lı Müaviyə yə tə slim etmə k üçün pulla aldatdığ ı

və nə hayə t İ mam ə leyhissə lamın qiyam üçün kömə k istə yə cə yi bir ordunun baş çısını İ mam ə leyhissə lamın öz

ə leyhinə qiyama qaldırdığ ı bir halda, İ mam ə leyhissə lamın sülhdə n baş qa çarə si vardımı? İ mam ə leyhissə lamın

e’tibar edə cə yi tə kcə insan var idisə , o da İ mam Hüseyn (ə leyhissə lam) idi. Ancaq .onu da sabahın Aş urası gözlə yirdi

Ə gə r Kə rbə la ş ə hadə tinin İ mam Hüseyn ə leyhissə lamın baş ına gə lmə zdə n qabaq İ mam Hə sə n

ə leyhissə lamın baş ına gə ldiyini qeyd etmə sə k və İ mam Hə sə n ə leyhissə lama Sabat günü fə dakarlıq meydanında

mə ğ lub olmayan bir qə hrə man rolunu mə zlum və ə ldə n düş mə miş mə ğ lub (yə ’nị sülhü mə cbur olub qə bul

.etmiş dir) bir ş ə xs simasında ifa etmə sinə nə zə r salmasaq, insafsızlıq etmiş olarıq

Əgər İmam Həsən (əleyhissəlam) Müaviyə ilə sülh saziş i bağ lamasaydı və hə mə n sülhün pozulması

sınağ ı camaat üçün irəli gəlməsəydi, şübhə siz kị İ mam Hüseyn ə leyhissə lamın .qiyamı da baş tutmayacaqdı

Ə gə r İ mam Hə sə n (ə leyhissə lam) Müaviyə ni özündə n sonra caniş in tə ’yin etmə k hüququndan mə hrum

etmə sə ydi və Müaviyə Yezidi özündə n sonra caniş in tə ’yin etmə klə bu maddə ni pozmasaydı, nə İ mam Hüseyn

ə leyhissə lamın qiyam etmə yə bir sə bə bi olardı̣ nə də onun ardıcılları ona bə raə t qazandırmaq üçün bir sübut tapa

.bilə rdilə r

## Sabat və Aşura Əməvilərin çirkin cahiliyyətinin ifşaçısı

O vaxtın camaatı Sabat və Aş ura hadisə lə rinə nə zə r salıb Əmə vilə rin çirkin .cahiliyyə tini açıq-aş kar gördü

Gördülə r kı̣ İ mam Hə sə n (ə leyhissə lam) sülh bağ ladı̣ ancaq Müaviyə sülhün ş ə rtlə rini pozaraq beş maddə nin

heç birinə riayə t etmə di. Nə öz hakimiyyə ti dövründə Qur'an və Peyğ ə mbə r (sə llə llahu ə leyhi və alih) sünnə si

ilə hə rə kə t etdı̣ nə özündə n sonra hakimiyyə ti onun ə sl sahibinə verdı̣ nə xə lifə seçmə yi ş uraya taps ırdı, nə

minbə rin hörmə tini Ə li ə leyhissə lamı söymə k üzündə n qoruyub saxladı̣ nə söz (verdiyi (Darabegə rd mə ntə qə sinin

xə racını verdı̣ nə də Ə li ə leyhissə lamın ş iə lə rini kiş ilikdə n uzaq olan ə zab-ə ziyyə .tlə rdə n qorudu

.Nə hayə t İ mam Hə sə n ə leyhissə lamı da zə hə rlə di

## Ən böyük istək və bacarmamaq

İ mam Hə sə n ə leyhissə lamın sakiṭ İ mam Hüseyn ə leyhissə lamın isə sə s-küylü qiyamı nə ticə sində gizli

mə sə lə lə r üzə çıxaraq gizli fikirlə r aş kar oldu. Bụ İ slamın İ mam Hə sə n ə leyhissə lamda gizlə nmiş qə zə bi

idi. Bu qə zə b İ mam Hə sə n ə leyhissə lamda qalaraq İ mam Hüseyn ə leyhissə lamın bə də nində cuş a gə lə n

.İ mamə t bünövrə sinin qanına çevrildi

İ mam Hə sə n (ə leyhissə lam) istə yib̤ ancaq istə diyini yerinə yetirə bilmə mə yin bir nümunə si idi. O̤ elə bir

mücahid idi kị döyüş lə rdə ki ş ücaə ti hamını heyran qoymuş və elə bir övlad idi kị atasının rə ş adə t

mə ktə bində n ş ə hadə t mə ktə binə qə də r ondan bə hrə lə nmiş və irs aparmış dı. İ mamə t meydanındakı

və zifə sini tə kcə sülhdə görüb necə böyüklük və sə birlə onu qə bul edə rə k dözdü. Bu İ mam Hə sə n

ə leyhissə lamın seçdiyi yolun gözə lliyi idi. Bundan baş qa heç bir ş ey deyildi. O̤ sükut və sülhü qılıncın tiyə sinə

oturtmaqla, İ slamı qoruyub saxladı. Onun kə sici dilị qə ti xütbə lə ri və kə skin çıxış ları qılınc sükutunun ə və zini lazımi

ş ə kildə çıxaraq bu yolla qardaş ının qanlı qiyamı üçün lazım olan ş ə raiti hazırladı. İ ş o yerə çatmış dı kị Müaviyə

onunla söhbə t etmə kdə n qorxur və hiylə ilə çalış ırdı kị onun sə sini boğ sun və mümkün qə də r onu

.mə clislə rdə danış mağ a qoymasın

## Geniş meydanlarda cihad

İ mam Hə sə n (ə leyhissə lam) islah yolunda ə n böyük addımı atdı. Fitnə -fə sad və silahın hakim olduğ u bir dövrdə

ə xlaq mə hə bbə t və islah mə ktə binin qapılarını açaraq mə qsə di islahdan baş qa heç nə olmayan bir ş ə xs kimi öz

adını Allah Rizası ilə ə və z etdi. O̤ ilk mə rhə lə də sülhə ə l atmadı̤ ə ksinə̤ iş in axırında

və bütün mübarizə

meydanlarında mə ğ lub olduqdan sonra sülhü qə bul etdi. Onun mübarizə si müxtə lif cə hə tlə ri olan geniş meydanlarda

oldu. Düş mə nlə mübarizə zamanı hə m ordunụ hə m sə ngə rị hə m də hiylə və kə lə klə rlə üzlə ş mə yi

imtahana çə kdi. Münafiq sə habə lə rinə qarş ı islah qüvvə sində ṇ nə fslə mübarizə də isə , qə zə bini boğ ub

.mə cbur edilmiş sülhü qə bul etmə kdə n istifadə etdi

Bu mə zlum və sakit İ mamın cihadlarına hə tta gözucu da olsa, nə zə r salmaqla hə r ...e’tiraza cavab vermə k olar

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲
.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳
.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴
.Nəşriyyatın mənbələrini qeyd etmək.۵
.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir
:Müəssisənin fəaliyyəti
.Kitabların çapı və nəşri.۱
.Kitab oxumaq müsabiqələrinin təşkili.۲
.Məcazi sərgilərin istehsalı.۳
.Kompüter oyunlarının istehsalı.۴
Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵
.Sərgi məhsullarının və moizələrin istehsalı.۶
.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷
.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸
.Təlim kurslarının həyata keçirilməsi.۹
Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰
Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı
JAVA.۱
ANDROID.۲
EPUB.۳
CHM.۴
PDF.۵
HTML.۶
CHM.۷
GHB.۸
.v.Qaimiyyə kitab bazarı adına dörd market
ANDROID.۱
IOS.۲
WINDOWS PHONE.۳
WINDOWS.۴
deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹